# İÇİNDƏKİLƏR

ÖNSÖZ ........ 5
Müəmmalı ixtisarlar ........ 7
Terminlərin təhrifi ........ 10
Tərcümə təvəhhümləri ........ 12
Hədisi yarımçıq nəql edib ........ 15
əz-Zəhəbi'yə dərs keçmək ........ 19
İdeoloji Təhrif Mövla Təbriki ........ 27
Əbu Bəkr və Ömər orada idimi? ........ 28
əz-Zəhəbinin münkər hökmü ........ 30
Mütəvatir sözündən sui-istifadə ........ 38
Xanımların Əhlul-Beytə daxil olması ........ 41
İdeoloji Təhrif Məsumluq ........ 44
Əli özü Mövla sözünü necə anlayıb? ........ 47
Qurandan ən son nazil edilən ........ 53
Yerinə oturmamış arqumentlər ........ 61
İradı cavabsız qoymaq ustalığı ........ 63

# ÖNSÖZ

Bu yaxınlarda Azərbaycandan göndərilmiş "Qədirxum Hədisi" başlığını daşıyan kitabı əlimə aldım və oxumağa başladım. Kitab xeyli bir zaman əvvəl əlimə keçsə də onu oxumağa yalnız bir-iki gün əvvəl fürsət tapa bildim. Kitabın üzərində müəllif olaraq "Şəmsəddin Zəhəbi" yazılıb və bu -bəli! - həmin məşhur əhlüs-sünnət alimi Şəmsuddin əz-Zəhəbi'dir. Üzərində onu ərəb dilindən tərcümə və tədqiq edənin Təbriz Qasımov olduğu yazılıb. Elmi rəy Rəşad Həsənova, redaktə isə Emin İmanlı'ya aiddir. İmam əz-Zəhəbi məşhur "qədirxum" hədisinin rəvayət yollarını toplayıb və bu risaləsində o, sadəcə olaraq bu hədisin hansı səhabələrdən rəvayət edildiyini və onların müxtəlif rəvayət yollarını bir araya gətirib. Kitabın nəşrinin arxasında "Tusi adına tədris və araşdırma məkrəzi" durur və anladığımız qədər ilə kitabı hazırlayanlar da bu mərkəzin əməkdaşlarıdır.
İlk olaraq onu qeyd etməyimiz lazımdır ki, bu "tərcüməni" Şəmsuddin əz-Zəhəbi'yə aid etmək bir xətadır, bu kitab əslində Təbriz Qasımov bəyin kitabıdır. Bunun izahı isə çox bəsitdir, çünki kitab 165 səhifədən ibarətdir, onun 78 səhifəsi Təbriz müəllimin müqəddiməsidir, geriyə qalan hissəsi isə əz-Zəhəbi'nin topladığı rəvayətlər və o rəvayətlər barəsində Təbriz müəllimin fikirləridir. Kitabın bu hissəsinin isə təxminən 50 faizi əz-Zəhəbi'nin risaləsindəki rəvayət və rəvayət yollarıdır, digər yarısı isə Təbriz müəllimin sözləridir. Belə çıxır ki, kitabın ümumilikdə 75 faizi Təbriz Qasımovun qələminə, 25 faizi isə əz-Zəhəbi'nin qələminə aiddir. Kitab həqiqətdə qismən əz-Zəhəbi'nin isnadlara verdiyi hökmlərə etirazlar, qismən də şiə məzhəbinin təbliğatıdır; misal üçün rəvayətlərin arasında Təbriz bəy bəzən "əhlul-beytin" kimlər olması haqqında müzakirə açır, bəzən İbn Teymiyyənin metodu tənqid olunur, bəzən əz-Zəhəbi'nin hədisşünaslıq bilikləri sual altına alınır. Ən önəmlisi isə budur ki, əz-Zəhəbinin hər səhabədən gələn versiya barəsində verdiyi hökmlər tamamilə kitabdan çıxarılıb, həmçinin mətnin bəzi yerləri hansısa səbəb göstərilmədən, izah verilmədən çıxarılıb və tərcümə edilməyib. Üstəlik əz-

Zəhəbi’nin gətirdiyi isnadlar isə əksər yerdə düşürülüb, halbuki əz-Zəhəbi’nin kitabı yazmaqdakı məqsədi isnadlardan başqa bir şey olmayıb. Kitabın orijinal adı da onu təhqiq etmiş şiə alimi Abdulaziz ət-Tabətabəi’nin qeyd etdiyi kimi “Mən Kimin Mövlasıyamsa Əli də onun Mövlasıdır hədisinin rəvayət yolları” (Risələtu Turuq Hədis Mən Kuntu Məvləhu fə-Aliyyun Məvləhu)” adlanır. Beləliklə də əz-Zəhəbinin kitabı ixtisar edilib, əz-Zəhəbinin özünə rəddiyyələr verilib və kitabın dörddə üç hissəsi əz-Zəhəbiyə aid deyildir. Ona görə bu kitabı əz-Zəhəbi’nin əsəri olaraq oxuculara satmaq - ən yumşaq dildə desək - dürüst əməl deyildir. Bu baxımdan bundan sonra Təbriz Qasımov müəllimə “kitabın müəllifi” və ya “müəllif” olaraq, bəzən də birbaşa adı ilə xitab edəcəyik. Ona görə də harada “kitabın müəllifi” xitabı ilə qarşılaşsanız bununla Təbriz müəllimi və kitab ilə onun “Qədirxum Hədisi” kitabını qəsd etdiyimiz anlaşılmalıdır.

Kitabın tərkibinə gəldikdə isə bu barədə etirazlarımız fərqli kateqoriyalara aiddir. Bunların bir hissəsi tərcüməylə bağlıdır, digər hissəsi isə müəllifin təqdim etdiyi izahlar və qeydlərlə bağlıdır. Tərcümədə təyin edə bildiyimiz xətalar və təhriflər də eyni ciddilikdə deyildir; bunların bir hissəsi texniki xətalardır və aldığımız məlumata əsasən bu kitab çox qısa müddətdə tərcümə olunub və çapa verilib. Təbii ki, bu, kitabdakı bəzi xətaların nə üçün baş verdiyini izah etsə də üzr sayıla bilməz, çünki oxucunun qarşısına çıxarılan hər bir iş məsuliyyət tələb edir. Kitabda tərcümə xətalarının bir qismi hədis elmindəki terminologiyaları doğru anlamamaqdan qaynaqlanır, belə ki, müəllif bir çox yerdə terminləri xətalı tərcümə etməkdən ziyadə onlara yanlış izahlar da verib. Biz bu cür xətaları daha çox hədis elmi sahəsindəki təcrübəsizlik ilə izah edə bilərik, başqa hansısa bir izahımız yoxdur. Bildiyimiz qədər ilə müəllif daha çox kəlam və fəlsəfə sahələri ilə məşğul olub və kitabın redaktoru Emin bəyin də əsasən fəlsəfə mövzularında aktiv olduğunu bilirik. Elmi rəy bildirən Rəşad bəyi isə tanımırıq. Tərcümədəki bəzi xətalar isə sırf ideoloji müstəvidə müəllifin zövqünə uyğun gəlməyən mənalardan yan keçmək məqsədi ilə edilib. Bunun misallarını aşağıda göstərmişik. əz-Zəhəbi’nin orijinal mətninin ixtisar edilmə şəkli də qəribədir. Bəzi yerlərdə heç bir izah verilmədən nələrsə çıxarılıb, bunun misalları ilə də tanış olacağıq. Ümumiyyətlə kitabı təhqid etmiş Abdulaziz ət-Tabətabəi orijinal mətnə əlyazmada olmayan yerlər

əlavə edib və bunu mötərizədə göstərib. Azərbaycan dilinə tərcümə edən Təbriz müəllim isə tərcümədə buna işarə etməyib.

## Müəmmalı ixtisarlar

Hər şeydən əvvəl mətnin ixtisarına toxunmağımız lazımdır. Misal üçün kitabın girişində əz-Zəhəbi'nin rəvayət haqqında dediyi bu cümlə düşürülüb: "Onu (yəni hədisi) səhih, həsən, zəif və tərk edilmiş (etibarsız) yollarla böyük bir camaat və çoxsaylı ravilər rəvayət etmişdir."[1] Bunu nə üçün düşürdüyünü anlamıram, halbuki bu, ümumən əz-Zəhəbinin kitabdakı isnadlar barəsində verdiyi mücməl və yığcam bir hökmdür. Qeyd etdiyimiz kimi kitabdan isnadlar düşürülüb, lakin bəzi yerlərdə isnadlar qorunulub, onlar düşürülməyib. İsnadını saxladığı və qeyd etdiyi yerlərdə ravilər haqqında əz-Zəhəbi'nin yer verdiyi bəzi önəmli hökmləri də çıxardıb. Misal üçün 49-cu rəvayətdə əz-Zəhəbi isnadın əvvəlində Rifəə əd-Dabbi adlı ravinin adından sonra "onu tanımıram!" yazır,[2] 83-cü rəvayətdə isnadın əvvəlindəki ravi Muhəmməd bin Xalid bin Abdilləh əl-Vasiti üçün "həlak olmuşlardan biri" hökmünü verir,[3] 86-cı rəvayətdə əz-Zəhəbi isnaddakı Həyyac bin Bistam'ın adının arxasınca "tərk olunmuşlardan biri" yazır[4], 97-ci rəvayətdə Musa bin Osman əl-Hədrami'nin adını çəkən kimi arxasında "tələf olmuşlardan biri" yazır.[5] Bunların heç biri tərcümədə öz əksini tapmır. Biz ilk öncə düşündük ki, müəllif bəlkə də ümumiyyətlə isnadları qeyd edərkən əz-Zəhəbinin verdiyi hökmlərin və ya vəsflərin hamısını çıxarıb, lakin gördük ki, bəzi yerlərdə müəllif bunu tərcümə edib. Ona görə də belə ixtisarların məqsədi tam aydın olmadı. Əgər isnadları saxlayırıqsa o zaman ravilər haqqında əz-Zəhəbi'nin hökmlərini düşürməkdə məqsəd nədir?!

Üstəlik əz-Zəhəbi kitabını hissələrə ayırıb, yəni bu hədisi rəvayət etmiş səhabələrə görə başlıqlar qoyub, hər başlığın altında həmin səhabədən gələn

[1] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 11;
[2] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 51;
[3] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 78;
[4] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 80;
[5] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 88;

rəvayət yollarını zikr edib. Lakin hər bölmədə həmin səhabədən bu rəvayətin sabit olub olmaması ilə bağlı hökm verir. Düşünürəm ki, bu, kitabda əz-Zəhəbinin əməyinin ən önəmli bir hissəsidir və bunun tərcüməyə yansıması lazım idi. Təbriz müəllim bunu etmədiyi üçün biz burada o hökmləri qeyd edəcəyik. Əbu Bəkr üçün yazır: "Ondan səhih gəlməyib" Ömər üçün yazır: "Ondan səhih gəlməyib." Əli üçün yazır: "Ondan mütəvatirdir." Talha üçün yazır: "Ondan səhih deyildir." Sad bin Əbi Vaqqas üçün yazır: "Ondan səhihdir." əl-Abbas üçün yazır: "Səhih deyildir." əl-Hüseyn bin Əli üçün yazır: "Ondan səhih gəlməyib." Zeyd bin Ərqam üçün yazır: "Ondan sabitdir." Bureydə üçün yazır: "Ondan səhihdir." Əbu Hureyra üçün yazır: "Ona aid bir neçə rəvayət yolu var." Əbu Said əl-Xudri üçün yazır: "İsnadı həsəndir." Cabir üçün yazır: "İsnadı ceyyiddir." İbn Abbas üçün yazır: "Sənədində zəif ravi var." əl-Bəra[6] bin Azib üçün yazır: "İsnadı həsəndir." Hubşi[7] bin Cunədə üçün yazır: "Ondan səhih gəlməyib." İbn Məsud üçün yazır: "Ondan səhih gəlməyib." İmrah bin Husayn üçün yazır: "Ondan səhihdir." İbn Ömər üçün yazır: "Səhih deyil." Ammar bin Yəsir üçün yazır: "Ondan səhih gəlməyib." Əbu Zərr üçün deyir: "Ondan səhih gəlməyib." Salman üçün yazır: "Səhih gəlməyib." Əs'ad bin Zurara üçün yazır: "Səhih deyil." Xuzeymə bin Səbit üçün yazır: "Səhih gəlməyib." Əbu Əyyub üçün bir hökm vermir. Suheyl bin Hənif üçün qeyd edir ki, Xuzeymə ilə birlikdə onun üçün də eyni hökm keçərlidir. Huzeyfə üçün hökm vermir, lakin gətirdiyi rəvayətlərin zəifliyini izah edir. Səmura[8] üçün də hökm vermir, amma ondan gələn rəvayətin tamamilə etibarsız olduğunu deyir. Zeyd bin Səbit üçün də bir hökm qeyd etmir, lakin ondan gələn rəvayət yollarını qeyd etdikdən sonra onların zəifliyinə toxunur. Ənəs bin Malik, Abdullah bin Yəmin və Abdulalə bin Adiy üçün də hökm vermir.

əz-Zəhəbi kitabında bu rəvayətin bir çox başqa səhabədən gəldiyinə, lakin onların da isnadlarının zəif olduğuna dair məlumat verir, lakin Təbriz müəllim o hissəni tam tərcümə etməyib. O, kitabında (səh: 162) yalnız bir cümləsinə yer verib: "Bu mətnin bir hədis aliminin tərk edəcəyi çoxlu sayda zəif yolları vardır, lakin səhih olanlar kifayət edir." əz-Zəhəbinin sözləri isə tam şəkildə belədir: "Bu mətnlə əlaqəli çoxsaylı zəif yollar (isnadlar) mövcuddur ki, mühəddislər onlardan uzaq dururlar, çünki səhih olanlarda

---

[6] əz-Zəhəbinin kitabını təhqiq etmiş ət-Tabətabə səhabənin adını "əl-Bərra" olaraq, şəddəli ra ilə yazır, Təbriz müəllim buna düzəliş etməyib. Səhabənin adı əl-Bəra, xəfif ra ilədir.

[7] Təbriz müəllim bu səhabənin adını kitabda Həbəşi olaraq verir. Doğru olan bizim yazdığımız şəkildir.

[8] Bu səhabənin də adını Səmərə olaraq yazıb.

(onlar üçün) kifayət edəcək miqdar var. Bu (zəif isnad)lardan bəziləri bunlardır: Həssən ibn Sabitdən və Allahın Rəsulunun – salləllahu aleyhi və səlləm – qızı Fatimədən - və bu, Əli bin Musa ər-Rida'nın uydurulmuş nüsxəsindəndir - (gəlir), Malik ibn Huveyrisdən muzlim (şiddətli zəif) bir yolla (gəlir); Zeyd ibn Harisə'dən də eyni şəkildə (gəlir); Ənəs ibn Malikdən, Peyğəmbərin – salləllahu aleyhi və səlləm – mövlasi Əbu Rafi'dən; Əbu Bərzə əl-Əsləmidən (gəlir), əl-Miqdad bin Amr əl-Kindi'dən muzlim bir sənədlə - orada Əbən ibn Əbi Əyyaş var - (gəlir), Əbu Leyla əl-Ənsari'dən; Sələmə bin əl-Əkva'dan; Zubeyr bin əl-Avvam'dan; Abdurrahman bin Auf'dan; Həsən ibn Əlidən; və Abdullah ibn Cəfərdən – həlak olmuş ravilərdən biri olan Abdullah bin Ibrahim əl-Ğifəri yolu ilə - (gəlir)."[9] Təbriz müəllimin kitabdan bu hissəni çıxarması qəribədir, çünki bu mətn birbaşa kitabın əsas qayəsinə aiddir, yəni Qədirxum hədisinin rəvayət yollarının çoxluğunu göstərir. Ola bilsin ki, Təbriz müəllim bunu isnad güman edərək kitabdan çıxarıb, çünki kitabının müqəddiməsində isnadları düşürəcəyini deyir. Lakin bu, isnad deyildir, hədisin başqa hansı səhabələrdən nəql olunmasına dair önəmli bir məlumatdır.

Kitabda ravilərin adları və nisbətləri tez-tez tamamilə təhrif olunmuş şəkildə təqdim olunur. Məşhur hədis imamı Məmər bin Raşid'in adı Müəmmər, İkrimə'nın adı Əkrəmə, Səmura'nın adı Səmərə, Hubşi'nin adı Həbəşi, İbn Humeyd'in adı İbn Həmid, Musab'ın adı Məsəb, Nueymin adı Nəim, Musarrif adı Musrif, Vəhb isə Vəhəb olub, ət-Teymi nisbəti ət-Timi, əl-Qavariri nisbəti əl-Qərariri, əl-Valibi nisbəti isə əl-Vali kimi yazılıb. 9-cu hədisdə Abdurrahmən bin Əbi Leyla dəyişib Əbdürrəhman ibn Əbu Yalə olub, 17-ci hədisdə Musab bin Sələm'in əl-Əcləh'dən rəvayəti Məsəb bin Salam bin əl-Əcləh'ə çevrilib, 35-ci hədisdə Əbu Qudəmə isə İbn Qudəmə olub, 77-ci hədisdə isə Bureydənin oğlu atası Bureydə'dən rəvayət etməli olduğu halda Bureydə öz atası əl-Husayb'dan rəvayət edir. 83-cü hədisdə "**Bu hədisi İraqın hafizi Əbu Bəkr vahid bir mətn şəklində rəvayət edib**" cümləsi əslində belə olmalı idi: "İraqın hafizi Əbu Bəkr bu hədisi Şərik'dən vahid bir mətn şəklində rəvayət edib." Bəzi yerlərdə isə əlavələr edilib, misal üçün 40-cı rəvayətdə əz-Zəhəbi sadəcə "isnadı güclüdür" dediyi halda tərcümə bunu "**isnadı olduqca güclüdür**" olaraq təqdim edir. Bu cür xətalar kitabda az deyildir, hər bir kiçik xətanı burada qeyd etməli olsaq yazımız

[9] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 100-101;

mənasız şəkildə uzanacaq. Bəzi xətaların isə redaktorun nəzərindən yayınması qəribədir.

## Terminlərin təhrifi

Qeyd etdiyimiz kimi kitabda hədis elmi ilə bağlı ciddi tərcümə xətaları və təhriflər də yer alır ki, biz onları sadəcə olaraq diqqətsizlik olaraq izah edə bilmərik. Bunlardan biri tez-tez qarşıma çıxan və təəccübümü doğuran bir xətadır. əz-Zəhəbi bir çox rəvayət yolundan danışarkən “mərfu” olaraq vəsf etdiyi yerləri müəllif “qopuq” olaraq tərcümə edib, yəni əz-Zəhəbi harda rəvayətin mərfu olduğunu deyirsə müəllif o rəvayətin isnadını qopuq kimi başa düşüb və o cür tərcümə edib. 2-ci, 15-ci, 42-ci, 71-ci, 112-ci, 113-cü və 115-ci rəvayətlərdə “mərfu sözü” hər yerdə “qopuq sənəd” olaraq tərcümə olunub. Əslində əz-Zəhəbi’nin kitabında “mərfu” sözü harada varsa müəllif onların hamısını “qopuq isnad” olaraq tərcümə edib. Çox qəribədir ki, müəllif “mərfu” termininin nə mənaya gəldiyindən xəbərsizdir. Hədis alimləri adətən bir rəvayətin mərfu və ya məvquf olduğunu deyirlər; məvquf rəvayət o rəvayətə deyilir ki, orada hədisi səhabə Peyğəmbərə - salləllahu aleyhi va əlihi va səlləm - nisbət etmədən danışır, yəni öz sözü olaraq keçir. Əgər bir hədis “mərfudursa” bu o deməkdir ki, səhabə o sözləri Peyğəmbərdən nəql edir. əz-Zəhəbi özü bunu belə izah edir: “Məvquf (موقوف): səhabənin sözünə və ya əməlinə isnad edilən rəvayətə deyilir. Onun müqabilində olan: mərfū (مرفوع) isə — Peyğəmbərin - salləllahu aleyhi və səlləm - sözünə və ya əməlinə nisbət edilən rəvayətdir.”[10] Belə bir xətanın necə diqqətsizlik üzündən baş verdiyini anlaya bilmirəm. Kitabda həmçinin “mürsəl” isnad ilə “munqati” isnadın hamısını “qopuq” olaraq tərcümə edib, halbuki bunların hər ikisi də fərqli terminlərdir. Ona görə də “mürsəl” sözü elə “mürsəl” termin olaraq saxlanılmalı və izah verilməli idi, “munqati” isə ya qopuq olaraq tərcümə edilə bilər, ya da o da bir termin olaraq saxlanılıb izahatla təmin oluna bilər. Mürsəl - əz-Zəhəbi’nin özünün izah etdiyi kimi -

[10] əz-Zəhəbi, “əl-Muqiza”, səh: 41; Əbu Ğuddə çapı.

səhabənin adının çəkilmədiyi, tabiinin birbaşa Peyğəmbərə nisbət etdiyi bir hədisdir. Munqati isə isnadın başqa yerindən bir və ya daha çox ravinin düşməsi, beləliklə isnad zəncirinin qopuq olmasıdır. Mahiyyət etibarı ilə aradakı fərq budur ki, mürsəl hədis - kimin mürsəli olmağından asılı olaraq - hüccət ola bilər, amma munqati hədis ittifaqla hüccət deyildir. Müəllif həmçinin kitabında "muzlim" isnadı "zəif" kimi tərcümə edib, halbuki bu termin isnadın sadəcə zəifliyinə yox, ondakı şiddətli zəifliyə, münkərliyə dəlalət edir. "Muzlim" isnad barəsində müəllif özü qısa da olsa (səh: 108) məlumat verib və muzlim sözünü "qaranlıq" kimi tərcümə edib, lakin naməlum səbəblərə görə kitabın başqa yerlərində "muzlim" sözünü sadəcə olaraq "zəif" sözü ilə tərcümə edib. Bəzən ümumiyyətlə heç tərcümə etməyib, misal üçün 64-cü rəvayətdə əz-Zəhəbi "bu, muzlim bir isnaddır, səhih deyildir"[11] dediyi halda Müəllif bunu "**hədisin sənədi səhih deyil**" şəklində tərcümə edib. 93-cü hədisdə isə "zəhibul-hədis" terminini sadəcə "zəif" olaraq tərcümə edir, halbuki "zəhibul-hədis" zəifdən də şiddətli termindir, çünki zəif ravi etibara alına bilər, zəhibul-hədis heç bir şəkildə etibara alınmaz, alimlər "zəhibul-hədis" terminini zəif mərtəbəsində aşağıda olan "tərk olunmuş" (mətruk), "saqit", hətta yalanda ittiham olunmuş ravilərlə bir sırada zikr edirlər.[12] 121-ci hədisdə isə "saqit" terminini "qopuq" şəklində tərcümə edir, halbuki "saqit" sözündə sənədin qopuqluğuna dair heç bir məna yoxdur, sənəd tam olaraq bitişik olsa belə "saqit" ola bilər. Saqit termini isə adətən yalanda ittiham edilmiş ravilərin rəvayət etdikləri hədislərə deyilir, bir növ "uydurma" hədis altına düşür. əz-Zəhəbi özü izah edir ki, bəzi alimlər uydurma hədisə "uydurma" deməyə cürət etmədiklərində ona "saqit", "mətruh" deyirlər.[13] Ola bilsin ki, müəllif burada "saqit" sözünün ərəb dilində "düşmək" mənasına gələn "səqata" felindən törədiyini nəzərə alaraq elə güman edib ki, isnadında hansısa ravi düşüb və buna görə də "sənədi qopuqdur" şəklində tərcümə edib. Əgər belədirsə bu ondan xəbər verir ki, müəllif hədis elmindəki terminlərlə ciddi məşğul olmayıb.

41-ci hədisdə çox qəribə bir xəta var. Müəllif kitabında əz-Zəhəbi'nin sözlərini belə tərcümə edir: "**Əbdül-Mumin Məstur zəif hesab olunmur. Mənsuru isə tanımıram.**" Bu tərcümənin eybi ondadır ki, müəllif "məstur"

---

[11] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 64;
[12] "Muqaddimətu İbn əs-Saləh", səh: 126;
[13] əz-Zəhəbi, "əl-Muqiza", səh: 36; Əbu Ğuddə çapı.

sözünün ravinin ləqəbi olduğunu düşünür. Lakin "məstur" bir termindir, ravinin ədalətinin məchul olduğunu ifadə edir. Yəni "Abdulmumin məsturdur, zəif olduğunu deməyiblər. Mənsuru isə tanımıram."[14] Hədis elmində "məstur" məchulun xüsusi bir növüdür, çünki bir ravinin ya "məchulul-ayn", ya da "məchulul-həl" olduğu deyilir, ikinci növə bir çox alim sadəcə "məstur" hökmünü aid edirlər, yəni halı "qapalıdır".[15] Məchul əl-ayn, yəni şəxsiyyəti məchul olan ravi o raviyə deyilir ki, haqqında əlimizdə olan məlumat onun adıdır və ondan yalnız bir ravi rəvayət edir.[16] Lakin əz-Zəhəbi'nin terminologiyasında "məstur" sadəcə məchul demək deyildir, ona görə "məstur" ravi rəvayətləri məqbul olan ravidir, həsən hökmündədir.[17]

## Tərcümə təvəhhümləri

Təbriz müəllim kitabında bir çox qəribə tərcümə xətalarına yol verib. 32-ci rəvayətdəki tərcümə xətasına da bir çox digərləri kimi hansısa üzr tapa bilmədim. Bundan əvvəlki misalda tərcümə etməli olduğu sözü bir ad, bir ləqəb kimi başa düşmüşdüsə, bu misalda isə bir ravinin adını bir söz olaraq tərcümə edərək xətalı bir məna ortaya çıxarıb. Müəllif tərcümədə deyir: "**Zəhəbi yazır: Hədisin sənədində zəif şəxslər çoxdur.**" Lakin bu tərcümənin xəta olması aşkardır, ümumiyyətlə ərəb dilində bu mənanı necə çıxarmağın mümkün olduğunu heç cür anlamaq olmur, çünki doğru tərcümə belə olmalıdır: "Kəsir (bin Zeyd)də zəiflik var." Aydındır ki, "Kəsir" adını ərəbcədəki "çox" mənasında başa düşüb.

47-ci hədisdə müəllif tərcüməni belə verir: "**Həsən dedi: "Əli ilə bəziləri və ya Üsamə ilə aralarında mübahisə düşdü.**" Mətnin orijinalında isə bu hissə belədir: "Əli ilə ailəsindən bir nəfər və ya Üsamə arasında mübahisə düşdü."[18] Müəllif kitabı boyunca səhabələr haqqında, əz-Zəhəbi haqqında inanılmaz və mübaliğəli spekulyasiyalar edir, onların niyyətlərindən, daxili

[14] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 48;
[15] Bax: İbn Dəqiq əl-İd, "əl-İqtirah fi Bəyən əl-İstilah", səh: 54;
[16] bax: "Muqaddimətu İbn əs-Saləh", səh: 224; ən-Nəvəvi, "ət-Təqrib vat-Təysir", səh: 50;
[17] bax: əl-Avni, "Şərh əl-Muqiza", səh: 199-200;
[18] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 51;

aləmlərindən xəbərlər verir. Müəlifin eyni metodunu tətbiq etməli olsaq deyə bilərik ki, burada çox ehtimal ki, Əlinin öz ailəsindən bir kimsə ilə mübahisə etməsi qulağa xoş gəlmədiyi üçün tərcümədə bu cür təhrifə yol verib, çünki məsum imamın əhli də onun kimi məsumlardan ibarət olub, axı necə mübahisə düşə bilərdi?! Lakin biz bu cür spekulyasiyalara yol verməyin elmi tənqidə yaraşmadığını anladığımız üçün belə bir spekulyasiyanı doğru kimi təqdim etməyəcəyik. Müəllifin kitabındakı bu cür insanların batinindən xəbərlər verməsini isə qarşıda - inşallah - müzakirə edəcəyik.

8-ci hədisdə də tərcümə xətası çox aşkardır. Müəllifin tərcüməsi belədir: "**Zəhəbi yazır: Yezid bin Əbu Ziyada çatan hədisin yolları bunlardır və o, hədisdə güclü biri deyil. Hədis alimlərinin onun hədislərini və bu mövzuda tək rəvayət etdiyi hədisləri bəyənib təriflədiklərini gördüm.**" Doğru tərcümə isə belə olmalıdır: "Bunlar Yezidə qədər çatan saleh rəvayət yollarıdır və o, (yəni Yezid) güclü deyildir. Onun hədisini həsən hesab etdiklərini gördüm və bunu o, təkbaşına rəvayət etməyib."[19] Tərcümədə iki yerdə xəta var, birinci burada əz-Zəhəbi sadəcə olaraq yolların bu olduğunu demək istəmir, o, rəvayət yollarının "saleh" olduğunu deyir, yəni ki, həsən dərəcəsindədir. İkinci xəta isə budur ki, müəllif elə güman edib ki, hədis alimləri Yezid bin Əbi Ziyadın tək rəvayət etdiklərini bəyənib tərifləyiblər, halbuki hədis elmindən yaxşı təsəvvürə sahib olan tələbə belə bir mənanı dərhal qəribə qarşılamalı idi, çünki alimlər heç vaxt bir ravinin - xüsusilə də güclü olmayan birinin - təkbaşına rəvayət etdiklərini tərifləməzlər, çünki bir ravinin nə qədər güclü olsa da hansısa rəvayəti təkbaşına rəvayət etməsində tərifəlayiq heç bir şey yoxdur, əksinə başqaları ilə bərabər rəvayət etməsi təriflənir. Qeyd edək ki, burada "bəyənib təriflədikləri" sözünə etiraz yoxdur, bu cür tərcümə mənanı dəyişmir, lakin biz "təhsin" sözünü "həsən hesab etmək" olaraq tərcümə etməyi daha doğru hesab edirik, çünki bu, mühəddislərin örfündə bir termindir.

48-ci rəvayətdə hədisin mətnindən önəmli bir hissəni tərcümə etməyi unudub; "Allahın, onunla dostluq edənə dost ol, düşmən olana düşmən ol!" hissəsini tərcümə etməyib. Böyük ehtimalla nəzərindən qaçıb və ya texniki bir xəta baş verib.

108-ci rəvayətdə "**Haqqa dəvət olunmusunuz**" cümləsi natamamdır, halbuki orijinal mətndə cümləni tamamlayan "cavab verin!" və ya "icabət

[19] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 20-21;

edin!” buyuruğu keçməkdədir. Böyük ehtimalla tərcümədə diqqətsizlik səbəbi ilə gözdən qaçırılıb. Amma eyni rəvayətin mətnindəki bir başqa tərcümə xətası sadəcə diqqətsizlik olaraq izah oluna bilməz. Rəvayətin əvvəlinin (səh: 153) tərcüməsini müəllif belə başlayır: “**Rəhbədə Əlinin yanında idi. Bu vaxt Əmr bin Hind əl-Muradi, sonra da Cəməl döyüşündə atası öldürülən əl-Cəməli gəldilər. İbn Hind dedi...**” Aydındır ki, müəllif ərəb dilindəki mətni oxuyanda elə düşünüb ki, burada iki nəfər həzrət Əlinin yanına gəlir, biri əl-Muradi, digəri isə əl-Cəməli’dir. Xətanın səbəbi isə budur ki, ərəbcə mətndə “əl-Muradi summə əl-Cəməli” sözü keçir, “summə” sonra deməkdir. Amma bu, bir nəfər, ondan sonra isə ikinci nəfərin gəlməsi mənasında deyildir, burada sadəcə olaraq bir nəfərin iki nisbəti ifadə olunur, yəni Amr bin Hind’in birinci nisbəti əl-Muradi, ikinci isə əl-Cəməli’dir, çünki atası Cəməl döyüşündə öldürülmüşdü. Yəni onun həqiqi nisbəti əl-Muradi’dir, ikinci nisbəti isə əl-Cəməli’dir.

101-ci rəvayətdə əz-Zəhəbi’nin təliqinin tərcüməsində “**Əqəbə bin Xalid əl-Əsədi, Həfs bin Ömər əl-Fərra və Yusif ibn Kuleyb ondan hədis rəvayət ediblər**” şəklində yazır, sanki burada ravi haqqında məlumat verilir, lakin əz-Zəhəbi’nin qəsdi bu deyil. əz-Zəhəbi deyir ki, “Aqabə bin Xalid əl-Əsədi, Həfz bin Ömər əl-Fərra və Yusuf bin Kuleyb ondan bu hədisi rəvayət ediblər.” Yəni burada ravi haqqında yox, rəvayətin isnad yolları haqqında məlumat verilir.

87-ci rəvayətdə əz-Zəhəbi’nin təliqini tərcümə edərkən (səh: 137) müəllif yazır ki, guya əz-Zəhəbi deyir: “**Bu hədisin hansı mənaya yozulmalı olduğunu bilmirəm.**” Bu onu göstərir ki, müəllif ərəb dilində mətni doğru oxuyub başa düşə bilməyib. əz-Zəhəbi’nin sözlərinin doğru tərcüməsi belə olmalıdır: “Bu hədisin (uydurulma məsuliyyətinin) kimin üzərinə qoyulacağını bilmirəm.” Çünki ərəb dilində “وما أدري على من يحمل هذا الحديث” cümləsində “alə mən” keçdiyi üçün burada şəxsdən danışır. Yəni bu rəvayətin isnadında birdən çox problemli ravi var və bunlardan hansının bu hədisi uydurduğunu əz-Zəhəbi bilmir.

36-cı rəvayətdə əz-Zəhəbi’nin sözlərini bu şəkildə verir: “**Yəhya - söylədiyi hədislər tərk olunub - Umeyradan hədisi rəvayət edib. Yəhya əl-Qattan Umeyra haqqında deyib: “Ona etimad olunmaz.” İbn Hibban onu (Yəhya ibn Sədi) “əs-Siqat” kitabında qeyd edib.**” Müəllifin İbn Hibban’ın siqa

saydığı ravini mötərizə içində “Yəhya bin Səd” olaraq təyin etməsi təəccüb doğurur, əslində İbn Hibban’ın zikr etdiyi ravi Umeyra bin Sad əl-Yəmi əl-Həmdəni’dir.[20]

## Hədisi yarımçıq nəql edib

82-ci rəvayətdə müəllif belə bir qeydə yer verir: “Zəhəbi burada hədisi yarımçıq nəql edib. Hədisin tam mətni İbn Əbi Şeybənin “əl-Musannəf” adlı əsərində yer alır...” Müəllif bunu kitabın ərəbcəsini təhqiq etmiş Abdulaziz ət-Tabətabə’nin sözlərindən götürür, beləki ət-Tabətabəi təhqiqində deyir: “Bu, İbn Əbi Şeybənin “əl-Musannəf” kitabındakı (12141) ləfzidir. Oradan bu miqdarını nəql etmiş və qalanını silmişdir! Halbuki orada keçir: Cavan oğlan dedi: ‘Mən səndən bəriyəm, şahidlik edirəm ki, sən Allahın dostunu düşmən bilmiş, düşmənini isə dost tutmusan!’ – Beləcə, camaat ona daş atmağa başladı! əz-Zəhəbi bu hissəni, möminlərin əmirinin – aleyhissələm – dostlarını düşmən bilənləri və düşmənlərini dost tutanları hörmətdə saxlamaq məqsədilə silib və onların hamısı günümüzə qədər bu tipdəndir! Zəif çıxardıqları o qədər şəxs var ki, bunu möminlərin əmiri - aleyhissələm - ilə dostluq etməkdən başqa günahına görə etməyiblər, amma ona düşmənlik etmiş və onunla müharibə etmiş şəxsləri siqa çıxarıblar!”[21] ət-Tabətabəi sadəcə olaraq əz-Zəhəbini nəqli yarımçıq kəsməkdə ittiham etsəydi deyərdik ki, şiə təhqiqçi burada insafsızlıq edib. Amma Həzrəti Əliyə sevgisinə görə hansısa ravini zəif çıxarmaq xislətini xüsusilikdə əz-Zəhəbi’yə, ümumilikdə isə əhlüs-sünnətə nisbət etmək çox çirkin bir iftiradır və səviyyəsiz bir etirazdır. Rəvayəti yarımçıq nəql etmək ittihamına gəldikdə, əgər ət-Tabətabəi və kitabın müəllifi Təbriz Qasımov müəllim diqqət etsəydilər görərdilər ki, əz-Zəhəbi rəvayəti “əl-Musannəf” kitabından gətirmir, onu Əbu Yalə əl-Məvsili’nin “əl-Musnəd” kitabından nəql edir[22] və Əbu Yalə əl-Məvsili “əl-Musnəd” kitabında bu rəvayəti elə məhz əz-Zəhəbi’nin nəql etdiyi kimi verir. Aydındır ki, əz-Zəhəbi burada heç bir şeyi yarımçıq gətirməyib, əksinə göstərdiyi qaynaqdan rəvayəti isnadı və tam

[20] İbn Hibban, “əs-Siqat”, 5/279;
[21] “Turuq Hədis Mən Kuntu Məvləhu”, səh: 76-77;
[22] Bax, “Musnəd Əbi Yalə”, 11/307 (6423) Hüseyn Səlim Əsəd təhqiqi.

mətni ilə olduğu kimi çatdırıb. Əlinin sevgisinə görə hansısa ravini cərh etmək ittihamına gəldikdə isə bu sünnət əhli alimlərinə qarşı bir iftiradır. əz-Zəhəbi elə sözünü etdiyimiz bu kiçik risalədə (səh: 102) Amr bin Həmməd bin Talha haqqında yazır: “Amr saduqdur, lakin rafizidir.” Yaxud da kitabın başqa yerində (səh: 155) yazır: “Muxavvəl rafizi olsa da, düzdanışandır.” əz-Zəhəbinin kitabları bu cür misallarla doludur və ümumən əhlüs-sünnət alimləri çox sayda ravini rafizi olmaqla ittiham etməklə yanaşı onları siqa sayıblar. Bizim müzakirəsini etdiyimiz kitabın müəllifi də eyni çirkin ittihama əl atır və 74-cü hədisdə əz-Zəhəbinin Atiyyə bin Said əl-Aufi haqqında “Atiyyə zəifdir” sözlərinə bir qeyd əlavə edərək yazır: “**Ətiyyənin bəzi sünni alimləri tərəfindən zəif hesab edilməsinə səbəb onun Əhli-beyt sevgisi ola bilər. Zəkəriyya ibn Yəhya əs-Saci onun haqqında belə deyir: “Əlini hamıdan üstün bilirdi.” İbn Həcər əl-Əsqəlaninin Məhəmməd ibn Səddən nəql etdiyinə görə, bir dəfə Həccac ibn Yusif Məhəmməd ibn əl-Qasimə məktub yollayır ki, Ətiyyəni həzrət Əliyə söyməklə imtahan etsin. Əgər imtina edərsə, ona 400 şallaq vursun və saqqalını qırxsın. Ətiyyə bu tələbdən imtina etdiyinə görə Həccacın dediyi hökm onun barəsində icra edilir. Yəhya ibn Məindən Ətiyyə haqqında soruşulduqda belə cavab verib: “Zəifdir, lakin hədisləri yazılır.” İbn Ədiy onun haqqında belə deyir: “Bəzi etibarlı şəxslər ondan hədis nəql ediblər. Onun Əbu Səiddən və başqalarından rəvayət etdiyi hədislər var. O, zəif olmasına baxmayaraq, hədisləri yazılır. Kufə şiələrindən hesab olunurdu.” Gördüyünüz kimi, bəzi alimlər onu zəif hesab etsələr də, ondan hədis qəbul edilməsinə icazə veriblər. Deməli, Ətiyyə düzdanışan şəxsdir, lakin onun dini və siyasi mövqeyi zəif hesab edilməsinə səbəb olub.**” Sitatın sonu. Sözün düzü bu çirkin və absurd izahı ifşa etmək üçün bunun harasından başlamağın daha doğru olacağını bilmirəm. Lakin yuxarıda qeyd etdiyim kimi sünnət əhli alimlərin kitablarında bir ravinin rafizi olduğunu yazmaqla yanaşı onun siqa olması ilə bağlı verilmiş hökmlərin sayı çoxdur. Bu onu göstərir ki, hansısa ravini sadəcə olaraq rafizi olduğu üçün zəif çıxarmayıblar. Kitabın müəllifi dürüst davransaydı sünni ricəl kitablarında Atiyyəni zəif hesab edənlərin nə üçün zəif olduqlarına dair dedikləri sözləri oxucusuna çatdırardı. Misal üçün İmam Əhmədin oğlu Abdullah atasından nəql edir: “Atamdan Atiyyə əl-Aufi barəsində soruşdum və dedi: “O, hədisi zəif ravidir.” Atam dedi: “Mənə çatan məlumata görə, Atiyyə əl-Avfi Kəlbi'nin yanına gedər və ondan təfsir haqqında soruşardı. O isə Kəlbini 'Əbu Səid' künyəsi ilə çağırardı və deyərdi:

'Əbu Səid (əl-Xudri) belə dedi. Huşeym Atiyyənin hədisini zəif hesab edərdi.”[23] Möminlərin əmiri Əliyə sevgisi ilə tanınmış Əhməd bin Şueyb ən-Nəsəi onun zəif olduğunu yazır.[24] İbn Hibban deyir: “Atiyyə əl-Avfi Əbu Səid əl-Xudridən bəzi hədislər eşitmişdi. Lakin Əbu Səid vəfat etdikdən sonra o, Kəlbinin yanına gedib onun məclislərində oturardı. Kəlbi 'Rəsulullah - salləllahu aleyhi va səlləm - belə buyurdu' deyərək nəql etdikdə, Atiyyə bunu yadda saxlayar və onu (yəni əl-Kəlbi’ni) 'Əbu Səid' künyəsi ilə çağıraraq ondan rəvayət edərdi. Ondan: 'Bunu sənə kim nəql etdi?' deyə soruşduqda, 'Mənə Əbu Səid rəvayət etdi' deyərdi. İnsanlar isə bunun Əbu Səid əl-Xudri olduğunu düşünərdilər, lakin o, əslində əl-Kəlbini nəzərdə tuturdu.”[25] Aydındır ki, Atiyyə əl-Aufi sadəcə olaraq şiə olduğu üçün zəif sayılmayıb, belə bir iddia yalandır. Təbriz müəllimin “onu zəif hesab etsələr də, ondan hədis qəbul edilməsinə icazə veriblər” sözünü deməyindən başa düşülür ki, o, “hədisi yazılar” sözü ilə alimlərin nəyi qəsd etdiklərini anlaya bilməyib, çünki bir ravi zəif olsa da onun hədisi şahid olaraq istifadə oluna bilər, yəni özlüyündə hədisi hüccət deyildir, amma şahid olaraq hədisinə baxmaq olar. Çünki İbn Adiy bu sözü onun başa düşdüyü mənada işlətmir; misal üçün Əhməd bin əl-Fərac bin Süleyman haqqında yazarkən deyir: “Hədisinə istinad ediləcək (dəlil gətiriləcək) və ya din baxımından əməl ediləcək (təşri və ya əqidədə əsas tutulacaq) bir ravi deyil, lakin hədisi yazılır.“ İbrahim bin əl-Fədl əl-Mədəni haqqında isə deyir: “Zəif olmasına baxmayaraq, hədisi yazılır. Lakin mənim qənaətimə görə onun hədisi ilə dəlil gətirilməsi caiz deyil.” İsmail bin Rafi Əbu Rafi əl-Mədəni haqqında isə deyir: “Hədislərinin hamısı haqqında problem olan növdəndir, lakin zəif ravilər sırasına daxil edilərək hədisi yazılır.” İsmail bin Muslim əl-Məkki haqqında isə yazır: “Hicaz, Basra və Kufə əhlindən rəvayət etdiyi hədislər məhfuz deyildir, lakin o, hədisi yazılanlardandır.” Bir kimsənin hədisinin məhfuz olmaması o deməkdir ki, siqa olan ravilərin rəvayət etdiklərinə müxalifdir, bununla belə hədisinin yazılması gərəkdiyini və şahid qismində baxılmasına ehtiyac olduğunu deyir. Bu cür misalları çoxaltmaq mümkündür. Buradan anlayırıq ki, Təbriz müəllimin bu sözdən bir ravinin hədislərinin məqbul olmasını anlaması doğru deyildir. Bu da yenə onun hədis fənni sahəsində

[23] Abdullah, “əl-İləl va Mərifətur-Ricəl”, 1/548;
[24] ən-Nəsəi, “əd-Duafə val-Mətrukin”, səh: 85;
[25] İbn Hibban, “əl-Məcruhin”, 2/167;

təcrübəsizliyindən və əhlüs-sünnət kitabları ilə tanışlığının olduqca zəif olmasından qaynaqlanır.
Kitablar haqqında təsəvvürün problemi olmasının bir başqa misalı 106-cı rəvayət barəsində əlavə etdiyi qeyddir. Bu qeydində yazır: "**Zəhəbi burada "İbn Ömərin müsnədi" kitabının adını qeyd edir və yuxarıdakı hədisin orada keçdiyini yazır. Böyük ehtimal burada Əbu Ümeyyə Məhəmməd ibn İbrahim ət-Tərsusinin "Musnədu Abdullah ibn Ömər" adlı kitabına işarə edir.**" Bu qeyd tamamilə yersiz bir qeyddir, çünki bu cür mətnləri oxumağa adət etmiş bir kimsənin başa düşməsi lazım idi ki, burada ayrıca bir müsnəd kitabından söhbət getmir. əz-Zəhəbinin sözü belədir: "İbn Uqdə bunu Əhməd bin Yəhya əs-Sufi, əl-Həsən bin Əli bin Affən və Yaqub bin Yusuf bin Ziyad'dan rəvayət edib; onlar dedilər: "Bizə Ubeydullah rəvayət etdi." Beləliklə də bunu İbn Ömərin müsnədində zikr etmişdir."[26] Buradan anlaşılan məna budur ki, İbn Uqdə'nin kitabı müxtəlif müsnədlərdən ibarətdir, yəni İbn Uqdə kitabında hər səhabənin rəvayətini ayrı-ayrı bölmələrdə toplayıb, bu rəvayəti də kitabın içində İbn Ömərin müsnədində zikr edib. Alimlər - misal üçün - Əhməd bin Hənbəlin hansısa hədisi Əli bin Əbi Talib'in müsnədində rəvayət etdiyini dediklərində buradan Əhmədin müstəqil bir kitabının olduğunu qəsd etmirlər, sadəcə olaraq onun şahəsəri olan "əl-Musnəd" kitabındakı çox saylı müsnədlərdən məhz Əlinin müsnədində rəvayət etdiyini nəzərdə tuturlar. Bu gün Şueyb Arnavut'un təhqiqi ilə çap olunmuş "əl-Musnəd" kitabının ikinci cildi başdan axıra qədər Həzrəti Əlinin müsnədindən ibarətdir. Əbul-Abbas İbn Uqdə əl-Kufi'nin (h. 249-332) "əl-Vilayət" kitabı isə məşhurdur.
Bunun daha bir misalı ilə tanış ola bilərik, belə ki, müəllifin kitabın ilk yarısında apardığı müzakirələrin içində etdiyi maraqlı bir xəta diqqətimi çəkdi. O, 52-ci səhifədə yazır: "**Hətta Təbəraninin rəvayət etdiyi, Səfiyyurrəhman əl-Mübarəkfurinin də "həsən" hesab etdiyi başqa bir hədisdə əvvəlki versiyadan fərqli olaraq "məndən sonrakı vəlilər" və "beytülmal" qeydləri də keçir.**" Görünür ki, Təbriz müəllim bəzi məlumatları qarışdırıb. Qarışdırdığı məlumatlardan biri budur ki, bu hədisin qaynağı olaraq göstərdiyi mənbənin, yəni "Tuhfətul-Əhvazi" kitabının müəllifi Abdurrahmən əl-Mubərakfuri (ö. h. 1353) ilə Safiyyur-Rahmən bin Abdilləh əl-Mubərakfuri əl-Azami'ni (ö. h. 1427) səhv salıb. İkinci xəta isə budur ki, əl-Mubərakfuri o hədisə orda "həsən" hökmü vermir. Hədisi qeyd

[26] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 91;

etdikdən sonra keçən “bu həsən bir hədisdir” sözləri ət-Tirmizi’nin “əs-Sunən” kitabındakı babda keçən tamamilə başqa hədis üçün dediyi sözlərdir və əl-Mubərakfuri sadəcə olaraq ət-Tirmizi’nin kitabını şərh etdiyi üçün onun o sözlərinə yer vermişdir.

## əz-Zəhəbi’yə dərs keçmək

Onu da qeyd edək ki, müəllif kitabında birdən çox yerdə İmam əz-Zəhəbi’yə hədis və rical elmində dərs keçməyə çalışır, əz-Zəhəbi’ni çox bəsit xətalar etməkdə ittiham edərək ona etirazlar edir. Misal üçün 93-cü hədisi belə tərcümə edir: “**İbn Abbas deyir: Peyğəmbər Vida həccindən qayıdanda Cöhfəyə yola düşdü. Cəbrail Peyğəmbərin yanına gəlib Əlini canişin təyin etməyi ona əmr etdi. Peyğəmbər dedi: “Ey Rəbbim! Qövmüm cahiliyyət dövründən təzə çıxıb. Bunu etsəm, deyəcəklər ki, öz əmisi oğlunu təyin etdi.” Sonra Peyğəmbər yola düşdü. Cöhfəyə çatanda Qədirxuma gəldi. Cəbrail ona bu ayəni gətirdi: ”Ey Rasul! Sənə nazil olanı təbliğ et!” Peyğəmbər camaat namazı qılmağı göstəriş verdi. Sonra Əlinin əlindən tutub dedi: “Mənim sizə özünüzdən daha çox haqq sahibi olduğumu bilirsiniz?!” Dedilər: “Bilirik, ey Allahın elçisi.” Peyğəmbər dedi: “Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır. Ey Allahım, onunla dost olanla dost ol, düşmən olanla düşmən; onu sevəni sev, ona nifrət edənə nifrət et; ona kömək olana kömək ol, yardım edənə yardım et!” İbn Abbas dedi: “And olsun Allaha, Əliyə itaət insanlara vacib oldu.**” Daha sonra əz-Zəhəbi’nin bu hədis barəsindəki hökmünü tərcümə edir: “**Zəhəbi yazır: “Bu, uydurma hədisdir. Kufəli yalançıların uydurmasıdır. Məhəmməd ibn Yəlanın ləqəbi Zənburdur. Buxari deyir: “Zəifdir.” Əl-Üqeyli Hüseyni etibarlı saymır. Yəhyanın kim olduğunu isə bilmirik.**” Bundan sonra Təbriz müəllim öz qeydinə yer verir və yazır: “**Zəhəbinin bu hədisi uydurma hesab etməsi yanlışdır. Bu hökm rical elmində qeyd olunan qaydalarla ziddiyyət təşkil edir. Gəlin hədisin sənədində Zəhəbinin etibarsız hesab etdiyi şəxsləri bir-bir araşdıraq. Məhəmməd ibn Yəla haqqında əksər tədqiqatçıların görüşü ondan ibarətdir ki, o, zəifdir, hədisləri tərk olunub, bəziləri də bunu onun cəhmiyyə məzhəbinə mənsub olması ilə əlaqələndiriblər. Bəziləri isə onun haqqında mötədil mövqe sərgiləyiblər.**

**Məsələn, İbn Hibban onun yalnız etibarlı şəxslərin rəvayət etdikləri hədislərə zidd düşən hədislərini qəbul etmir. Buradan belə anlaşılır ki, onun digər hədislərinə etimad etmək olar. Əl-İcli isə ondan hədis yazdığını, lakin insanların onun hədislərini tərk etdiyini söyləyir, sonra da onun cəhmiyyə məzhəbinə mənsub olduğunu eşitdiyini yazır. Əl-İcli ondan hədis yazıbsa, deməli, onu etibarlı bilir, əks təqdirdə, hədis uyduran birinin sözlərinə etimad etməzdi. Əl-İclinin onun cəhmiyyə məzhəbinə mənsub olduğunu söyləməsi, insanların niyə onun hədislərini tərk etdiyini göstərir.**
**Zəhəbinin tənqid etdiyi ikinci şəxs Hüseyn adlı ravidir. Əl-Üqeyli onu etibarlı hesab etmir. Bu da onun zəif olduğunu göstərir. Yəhya ibn Munqizə gəldikdə isə, Zəhəbi onun kim olduğunu bilmədiyini yazır, deməli, o, məchuldur, yəni haqqında məlumat yoxdur. Rical elmində qeyd olunan qaydalara əsasən, hədisi rəvayət edən şəxslərdən birinin ya kimliyi, ya da halı, yəni ədalətli olub-olmaması məlum deyilsə, onda bu hədislər zəif hesab olunur. Əlbəttə, burada bəzi istisnalar var. Məsələn, ədalətli olub-olmadığı məchul olan ravidən etibarlı şəxslər hədis rəvayət edərsə, onda onun hədisinə etibar etmək olar. İbn Əbu Hatim deyir ki, "atamdan etibarlı olmayan şəxslərdən etibarlı şəxslərin hədis rəvayət etmələri barədə soruşdum. Atam dedi ki, əgər hansısa ravinin zəif olduğu məlumdursa, onda ondan başqa etibarlı ravilərin hədis nəql etmələri onun hədisini gücləndirməz. Lakin ravi məchuldursa, bu halda gücləndirər. Zəhəbinin barəsində danışdığı şəxs Yəhya ibn Munqiz məchul şəxsdir, lakin ondan hədis nəql edən Übeydullah ibn Musa etibarlı biridir. Deməli, onun hədisinə etimad etmək olar. Bütün bu qeyd olunanlardan aydın oldu ki, Zəhəbinin yuxarıdakı hədisə uydurma deməsi üçün heç bir məntiqli səbəb yoxdur. O, hədisə uzaqbaşı zəif deyə bilər. Bu da nəticədə heç bir problem yaratmır, çünki hədis mütəvatir olduğuna görə digər onlarla səhih hədis bu hədisin sənədini möhkəmləndirir və ortada onu inkar etmək üçün artıq heç bir səbəb qalmır.**" Sitatın sonu. Müəllif burada İmam əz-Zəhəbi ilə elə davranır ki, sanki o, mustalah və rical elmində sinifdə qalmış bir şagird olub. Halbuki bu kitabı oxuyanda əmin oldum ki, burada bəsit xətalar edən kitabın müəllifidir və belə görünür ki, onun məşğul olduğu sahə əsasən kəlam və fəlsəfə sahələridir, hədis və rical barəsindəki bilikləri bizi məyus edir. Elə burada əz-Zəhəbi'yə etdiyi etirazlar

da bunun aşkar misalıdır. Gəlin biz də müəllifin əz-Zəhəbi'yə etirazlarına bir-bir baxaq.
Hər şeydən əvvəl onu qeyd etməliyik ki, hədislərin sihhətinə və zəifliyinə dair hökm vermək üçün təkcə rical elmi kifayət etmir və ümumiyyətlə belə bir hökm vermək üçün həm rəvayət, həm də dirayət sahələri şərtdir, rical elmi sadəcə bunun bir hissəsidir. Uydurma hədislər haqqında yazılmış kitabların müqəddimələrində bir hədisə hansı hallarda uydurma hökmü verməyin yolları barəsində kifayət qədər məlumat var. İkincisi isə yuxarıda qeyd etdiyim kimi əz-Zəhəbinin buradakı sözünü - "Buxari deyir: zəifdir" şəklində tərcümə etmək xətadır, çünki burada əl-Buxari "zəhibul-hədis" deyir. Bunu İbnus-Saləh dördüncü mərtəbəyə aid edir və deyir: "Əgər "mətrukul-hədis" və ya "zəhibul-hədis" və ya "kəzzəb" (yalançı) desələr, belə birinin hədisi etibardan düşmüş sayılır, onun hədisi yazılmaz və o, dördüncü mərtəbədir."[27] Təbriz müəllim burada bu raviyə etibar qazandırmaq üçün görün nə deyir: "**Bəziləri isə onun haqqında mötədil mövqe sərgiləyiblər. Məsələn, İbn Hibban onun yalnız etibarlı şəxslərin rəvayət etdikləri hədislərə zidd düşən hədislərini qəbul etmir. Buradan belə anlaşılır ki, onun digər hədislərinə etimad etmək olar.** " Əgər Təbriz müəllim əziyyət çəkib öz anlayışının doğru olub olmadığını yoxlamaq üçün sadəcə İbn Həcərin "Təhzibut-Təhzib" kitabına etibar etməyib İbn Hibbanın öz kitabına baxsaydı görəcəkdi ki, İbn Hibbanın sözündən belə bir məna çıxarması doğru deyil. İbn Hibbanın bu ravi haqqındakı sözləri belədir: "Muhəmməd bin Yalə əs-Suləmi (və ya əl-Əsləmi), ləqəbi Zunbur; Kufə əhlindəndir, kunyəsi Əbu Əli'dir... Xəta edənlərdən biri idi, hətta rəvayət etdiyini məqlub şəkildə gətirərdi, belə ki, işin əhli o hədisi eşidəndə bu hədisin qurma və ya məqlub olduğunu bilərdi. Ona görə də onun siqa ravilərə müxalif şəkildə rəvayət etdikləri ilə, siqa ravilərə müxalif olmasa belə təkbaşına rəvayət etdikləri ilə ihticac etmək icazəli deyildir."[28] Gördüyümüz kimi əz-Zəhəbi kimi bir alimə dərs keçməyə çalışan Təbriz müəllim İbn Həcərin müxtəsər nəqlini öz məzmunundan qoparıb onu ravinin xeyrinə işlətməyə çalışır. Təbriz müəllim sözünün davamında deyir: "**Əl-İcli ondan hədis yazıbsa, deməli, onu etibarlı bilir, əks təqdirdə, hədis uyduran birinin sözlərinə etimad etməzdi.**" Bu cümlə isə başdan ayağa müsibətdir. Başqa yerdə də İbn Adiy əl-Curcəni'nin "hədis yazmasını" xətalı şəkildə anlamışdı, burada da əl-

---

[27] "Muqaddimətu İbn əs-Saləh", səh: 126;
[28] İbn Hibban, "əl-Məcruhin", 2/267-268; Zəyid çapı.

İcli üçün eyni üslubu tətbiq edir. Bilmək lazımdır ki, əl-İclinin bir kimsədən hədis yazması ona etibar etməsi anlamını vermir. Misal üçün əl-İcli kitabının bir yerində "Əbu Rabia" adlı bir ravi haqqında bu sözləri deyir: "Basralıdır, zəifdir. Ondan (hədis) yazmışam və o, bir şey deyildir."[29] Əgər əl-İcli - "ondan yazmışam" deməklə hansısa raviyə etibar qazandırmağı qəsd etsəydi o sözünün arxasında həmin ravi haqqında - "o bir şey deyildir" deməsi tamamilə ziddiyyət olardı. əl-İcli sadəcə olaraq özünün nə vaxtsa onun məclisində oturub hədis yazdığını xəbər verir, bununla həmin ravinin etibarlı olduğunu qəsd etmir. Burada da Muhəmməd bin Yalə'dən hədis yazdığını dedikdən sonra "insanlar (yəni alimlər) onu tərk ediblər" deyərək onun mətruk olduğuna hökm edir. Bütün bunlardan sonra Təbriz müəllimin dönüb - "**əl-İclinin onun cəhmiyyə məzhəbinə mənsub olduğunu söyləməsi, insanların niyə onun hədislərini tərk etdiyini göstərir**" deməsinin artıq nə dərəcədə dəyərsiz bir nəticə olduğunu özünüz başa düşürsüz. Bu tamamilə absurd bir nəticədir və biz burada ədəb həddini aşmamaq üçün ehtiyatla tənqid etməyə çalışırıq, lakin həqiqətdə bu cür mülahizələrin heç bir elmi dəyəri yoxdur. Bir ravi haqqında "cəhmidir" və ya "rafizidir" deyildiyini misal göstərib onun zəif sayılmağını bununla izah etmək çox ucuz bir cəhddir. İsnadındakı Hüseyn bin Əbi Burdə haqqında isə deyir: "**Zəhəbinin tənqid etdiyi ikinci şəxs Hüseyn adlı ravidir. Əl-Üqeyli onu etibarlı hesab etmir. Bu da onun zəif olduğunu göstərir.**" Xeyr, Hüseyn bin Əbi Burdə sadəcə zəif deyildir, o ümumiyyətlə məchuldur. əz-Zəhəbi burada əl-Uqeyli'nin onu cərh etdiyini deyərkən əl-Uqeylinin cərhinə baxmadan bir söz söyləmək yalnışdır. əl-Uqeylinin cərhi isə bundan ibarətdir: "Hüseyn bin Əbi Burdə kufəlidir, hədisində vəhm (xəta) var; hədisində (başqalarına) müxalif olur."[30] Beləliklə də başa düşürük ki, əl-Uqeyli burada Hüseynin şəxsini yox, onun hədisini cərh edir, hədisinin başqalarının hədisinə müxalif olduğunu, xəta olduğunu bəyan edir. Özünə gəldikdə isə Hüseyn məchuldur, ondan yalnız qardaşı Harun rəvayət edir. Ona görə də əz-Zəhəbi onun haqqında deyir: "Bunun kim olduğu bilinmir."[31] Hədis elmində bu raviyə "məchulul-ayn" deyilir. Burada məchul olan təkcə Hüseyn deyil, ondan bu hədisi rəvayət edən qardaşı Harun bin Əbi Burdə də məchuldur, haqqında rical kitablarında heç bir məlumat yoxdur. Kitabın

---

[29] əl-İcli, "əs-Siqat", 2/401 (2145)
[30] əl-Uqeyli, "əd-Duafə əl-Kəbir", 1/253 (305)
[31] əz-Zəhəbi, "Mizənul-İtidəl", 1/531;

müəllifi bizi təəccübləndirməyə davam edərək yazır: “**Məsələn, ədalətli olub-olmadığı məchul olan ravidən etibarlı şəxslər hədis rəvayət edərsə, onda onun hədisinə etibar etmək olar. İbn Əbu Hatim deyir ki, “atamdan etibarlı olmayan şəxslərdən etibarlı şəxslərin hədis rəvayət etmələri barədə soruşdum. Atam dedi ki, əgər hansısa ravinin zəif olduğu məlumdursa, onda ondan başqa etibarlı ravilərin hədis nəql etmələri onun hədisini gücləndirməz. Lakin ravi məchuldursa, bu halda gücləndirər.**” Doğrusu İbn Əbi Hətim ər-Razi’nin sualı belədir: “Atamdan soruşdum: “Siqa ravilərin siqa olmayandan rəvayət etməkləri onu gücləndirən bir şeydir? Dedi: “Əgər zəifliyi ilə tanınan biridirsə ondan rəvayət etməsi onu gücləndirməz, əgər məchuldursa siqaların ondan rəvayəti ona fayda verər.” Abdurrahmən deyir: “Əbu Zura’dan siqa ravilərin bir nəfərdən rəvayəti barədə soruşdum; onun hədisini gücləndirirmi?” Dedi: “And olsun ki, bəli!”[32] Hədis elmlərindən anlayışı olan həs bilir ki, məsələ bu qədər bəsit deyildir, çünki burada sual çıxır. Əbu Hətim ər-Razi “məchul” dedikdə hansı məchulu qəsd edir, ədaləti məchul olanı yoxsa şəxsi məchul olanı? Gücləndirmək dedikdə burada qəsdi ravinin siqalaşmasıdır, yoxsa şahid və dəstək qismində etibar qazamdırmasıdır. Həmçinin burada siqa deyildikdə üzərində ittifaq olunmuş və tanınmış siqa ravilər qəsd olunur, yoxsa haqqında tənqid varid olmuş, lakin ümumən səduq hesab edilmiş ravilər üçün də eyni şey keçərlidir. Üstəlik burada tək bir siqa ravinin rəvayəti kifayət edir, yoxsa rəvayət edən siqa ravilərin sayı birdən çox olmalıdır? Bütün bu suallar hədis elmi kitablarında müzakirə olunan məsələlərdir, heç kim Əbu Hatim ər-Razi’nin sözündən “Qədirxum Hədisi” kitabının müəllifinin başa düşdüyü mənanı başa düşməyiblər. İbn Rəcəb misal üçün bu nəqli gətirdikdə Əbu Hətim ər-Razi’nin sözünün ardınca onun bu dediyinə belə bir misal verir: “(İbn Əbi Hətim) dedi: Atamı belə deyərkən eşitdim: “Əgər Şubə’ni bir nəfərdən rəvayət edərkən görsən bil ki, o siqadır; tək-tük nəfər müəyyən olaraq istisnadır.”[33] İbn Rəcəb eyni məzmunda bundan bir neçə səhifə əvvəl bu məsələ barəsində danışarkən başqa alimin sözünü də misal verir: “Yaqub bin Şeybə dedi: Yəhya bin Main’ə soruşdum: “Ravi nə zaman məruf (tanınan, yəni qeyri-məchul) olur? Necə nəfər ondan rəvayət etdikdə?” Dedi: “Əgər ravidən İbn Sirin, əş-Şabi və bu elm əhli rəvayət etdiklərində, o artıq məchul deyildir.” Soruşdum: “Bəs əgər ravidən

[32] İbn Əbi Hətim, “əl-Cərh v.at-Tədil”, 2/36;
[33] İbn Rəcəb, “Şərh İləl ət-Tirmizi”, 1/381;

Simək bin Hərb və Əbu İshaq kimiləri rəvayət etsə?" Dedi: "Bunlar məchullardan da rəvayət edirlər." Bunu nəql etdikdən sonra İbn Rəcəb bu təfsilatı bəyəndiyini deyir.[34] Ibn Kəsir də qeyd edir ki, əgər məchul ravidən rəvayət edən siqa ravi - İmam Malik kimi - rəvayət etdiyi şeyxin adil olmasını şərt qoşanlardandırsa o zaman onun rəvayəti məchulu təvsiq etmək sayılacaq, əks təqdirdə sayılmır.[35] Beləliklə də başa düşürük ki, burada söhbət hər siqanın rəvayət etdiyi qəsd olunmur, lakin xüsusilə öz şeyxlərini seçən siqa ravilərdən söhbət gedir, çünki İbn Sirin, Şubə kimi hədis imamları yalnız etibar etdikləri şəxslərdən rəvayət etmələri ilə tanınıblar. Ola bilər ki, Şubə kimi bir imam təkbaşına bir məchul ravidən rəvayət etməklə həmin ravi etibar qazansın. Ola da bilər ki, Sufyan əs-Səvri kimi iki və ya üç siqa ravinin rəvayət etməsi ilə etibar qazanmış olsun. Bütün bunlar həmin məchul ravinin rəvayətlərində münkər mətnlərin və müxalifətlərin olmaması halına aiddir, əks təqdirdə siqa ravinin rəvayət etməsi fayda verməz. Bu dediklərimizdən sonra kitabın müəllifinin ortaya çıxardığı qaydanı tətbiq etməyinə baxaq. Yazır: "**Zəhəbinin barəsində danışdığı şəxs Yəhya ibn Munqiz məchul şəxsdir, lakin ondan hədis nəql edən Übeydullah ibn Musa etibarlı biridir. Deməli, onun hədisinə etimad etmək olar.**" Yəhya bin Munqiz'in kim olduğu bilinmir, haqqında heç bir məlumat yoxdur, onun həqiqətən tarixi bir şəxsiyyət olub olmadığını da bilmirik, belə bir kimsə haqqında "məchulul-ayn" deyilir. Ona görə də hansısa "mötəbər" birinin ondan rəvayət etməsi ona heç bir fayda verməz, çünki qeyd etdiyimiz kimi burada ravinin "mötəbər" olması kifayət etmir. Üstəlik ondan rəvayət edən Ubeydullah bin Musa kimdir? Bu adla tanınmış bir ravi var və o, Ubeydullah bin Musa bin Bəzəm əl-Absi, misal üçün rəvayət kitablarına baxdıqda görürük ki, Ubeydullah ilə İbn Abbas arasında adətən iki və ya üç ravi keçir. Misal üçün İbn Əbi Şeybə "əl-Musannəf" kitabında Ubeydullahdan, o da Osman bin əl-Əsvad'dan, o isə Muhəmməd bin Abdirrahmən bin Əbi Bəkr'dən, o da İbn Abbas'dan rəvayət edir. Bir başqa qaynaqda o, İsrail'dən, o isə Abdulkərim'dən, o İkrimə'dən, o da İbn Abbasdan rəvayət edir. Yaxud da Əli bin Saleh'dən, o Simək'dən, o isə İkrimə'dən, o da İbn Abbasdan, ya da İbrahim bin İsmail'dən, o da Davud bin Husayn'dan, o isə İkrimə'dən, o da İbn Abbasdan, ya da Musa bin Ubeydə'dən, o da Muhəmməd bin Amr bin Ata'dan, o isə İbn Abbas'dan

[34] Eyni mənbə, 1/377-378;
[35] Bax: "əl-Bəis əl-Həsis Şərh İxtisar Ulum əl-Hədis", səh: 189;

rəvayət edir.[36] Ubeydullah bin Musa hicri 120-ci ildə doğulub və hicri 213-cü ildə vəfat edib, onun ən qədim şeyxləri sayılan Hişəm bin Urva və Süleyman bin Mihran əl-Aməş hicri 61-ci ildə doğulublar. Mücahid, Said bin Cubeyr, Tavus, Ata və İbn Abbasın digər tələbələrindən heç bir yerdə birbaşa rəvayəti yoxdur. Ona görə də bu isnaddakı Ubeydullah bin Musa'nın məşhur İbn Bəzən əl-Absi ola bilməz. Buradakı Ubeydullah bin Musa əslində Ömər bin Musa bin Vəcih əl-Vəcihi əl-Himsi əl-Ənsari'dir. Məşhur yalançı ravidir və Əlinin fəzilətləri haqqında uydurma hədislər rəvayət edir. İbnul-Məğazili (ö. h. 483) deyir: "Əbu Abdilləh Muhəmməd bin Əbi Nəsr bin Abdilləh əl-Humeydi bizə rəvayət etdi; Əbu Zəkəriyya Abdurrahim bin Əhməd əl-Buxari bizə rəvayət etdi; Əbu Muhəmməd Abdulğani bin Said əl-Hafiz bizə rəvayət etdi; Əbul-Hüseyn Əli bin Abdilləh bin əl-Fədl ət-Təmimi bizə rəvayət etdi ki, Abdullah bin Zeydən onlara rəvayət edib və deyib: Harun bin Əbi Burdə izə rəvayət etdi; Qardaşım Hüseyn bizə Yəhya bin Yalə'dən, o da Ubeydullah bin Musa'dan, o da əz-Zuhri'dən, o da əs-Səib bin Yezid'dən belə dediyini rəvayət etdi; Allahın elçisi - salləllahu aleyhi va səlləm - dedi: "Əlidən başqa heç bir müsəlmana mənim çılpaqlığımı və ya övrətimi görmək halal deyildir."[37] Bu rəvayəti İbnul-Cəvzi uydurma hədislər barəsində yazdığı kitabda gətirir və deyir: "Bu hədis uydurmadır, bununla ittiham olunan Ubeydullah bin Musa'dır və o, Ömər bin Musa əl-Vəcihi'dir, zəif olduğu üçün (ondan rəvayət edən) ravi onun adını dəyişib."[38] əd-Dəraqutni yazır: "Ömər bin Musa bin Vəcih əl-Vəcihi… ondan Yəhya bin Yalə əl-Əsləmi rəvayət edir və "Ubeydullah bin Musa" deyir, onun bu Ömər olduğu deyilib."[39] Aydın oldu ki, buradakı Ubeydullah bin Musa əslində Ömər bin Musa əl-Vəcihi'dir. Onun haqqında isə onun yalançı olduğunu deyiblər. Ufeyr bin Mədən əl-Kələi deyir: "Ömər ibn Musa əl-Vəcihi yanımıza gəldi. Biz də onun yanına toplaşdıq. O isə tez-tez bu cür rəvayət etməyə başladı: 'Saleh şeyxiniz bizə xəbər verdi…", "saleh şeyxiniz bizə xəbər verdi…". Nəhayət, bu sözləri o qədər təkrarladı ki, ona spruşdum: 'Bizim o saleh şeyximiz kimdir? Adını de tanıyaq.' Dedi: 'Xalid ibn Mə'dan.' Mən ona dedim: 'Neçənci ildə onunla qarşılaşmısan?" Dedi: "Yüz səkkizinci ildə." Soruşdum: "Bəs onunla harada qarşılaşmısaa?' Dedi: 'Ərməniyyə yürüşündə.' Mən isə ona dedim: 'Ey şeyx, Allahdan qorx, yalan danışma! Xalid bin Mə'dan yüz dördüncü ildə ölüb, sən

[36] Bax: "əl-Musannəf", 13/342 və 15/296, 429 və 16/279; "Tarix İbn Main", 3/485 (2370);
[37] İbn əl-Məğazili, "Mənaqib Əli", səh: 150 (137);
[38] İbn əl-Cəvzi, "əl-Məvduat", 2/177 (735), Ədvaus-Sələf, Riyad, 1997
[39] əd-Dəraqutni, "əd-Duafə val-Mətrukin", səh: 182 (373), əl-Məktəb əl-İsləmi, 1980

isə iddia edirsən ki, onunla ölümündən dörd il sonra görüşmüsən!' Çünki Xalid ibn Mə‘dan yüz dördüncü (hicri) ildə vəfat edib. Üstəlik sənə bir şeyi də əlavə edim: O heç vaxt Ərməniyyəyə yürüş etməyib. O, yalnız rumlara qarşı vuruşub."[40] Əbu Hətim ər-Razi deyir: "Mətrukul-hədis, zəhibul-hədis, hədis uydurardı."[41] İbn Adiy onun barəsində deyir: "O, hədislərə mətn və isnad uyduran ravilərdən biridir."[42] İbnul-Məğazili'nin isnadına diqqət etsək görəcəyik ki, isnadı Abdullah bin Zeydən əl-Bəcəli - Harun bin Əbi Burdə - qardaşı Hüseyn bin Əbi Burdə - Yəhya bin Yalə əl-Əsləmi - Ubeydullah bin Musa zəncirindən ibarətdir. əz-Zəhəbinin kitabında İbn Abbasa nisbət edilən bu Qədirxum hədisinin isnadı isə Abdullah bin Zeydən əl-Bəcəli - Harun bin Əbi Burdə - qardaşı Hüseyn bin Əbi Burdə - Muhəmməd bin Yalə əl-Əsləmi - Ubeydullah bin Musa zəncirindən ibarətdir. Aradakı yeganə fərq bunu Ubeydullahdan rəvayət edən ravidədir; buradakı Muhəmməd ya Yəhya bin Yalə'nin qardaşıdır, qardaşının şeyxi Ömər bin Musa bin Vəcih'dən qardaşının etdiyi kimi Ubeydullah bin Musa deyərək rəvayət edir, ya da burada ondan sonrakı ravilər xəta ediblər və Yəhya bin Yalə yerinə Muhəmməd bin Yalə deyiblər, yaxud da əz-Zəhəbinin əlyazmasında xəta düşüb. İstənilən halda ortaya çıxan nəticə budur ki, isnadında üç ravi məchuldur və bunlar Harun bin Əbi Burda, qardaşı Hüseyn və Yəhya bin Munqiz'dir, Muhəmməd bin Yalə isə mətrukdur, Ubeydullah bin Musa isə yalançı ravidir. Bütün bunları bildikdən sonra Təbriz müəllimin əz-Zəhəbi'yə keçdiyi dərsin sonunda gəldiyi nəticəni bir daha oxuyaq: "**Bütün bu qeyd olunanlardan aydın oldu ki, Zəhəbinin yuxarıdakı hədisə uydurma deməsi üçün heç bir məntiqli səbəb yoxdur.**" Bu nəticənin nə qədər insafsız olduğu məncə aydındır.

---

[40] əl-Fəsəvi, "əl-Mərifə vat-Tərix", 1/152 və 1/700-701; əl-Uqeyli, "əd-Duafə əl-Kəbir", 3/190 (1186);
[41] İbn Əbi Hətim, "əl-Cərh vat-Tədil", 6/133;
[42] İbn Adiy, "əl-Kəmil fi Duafə ər-Ricəl", 6/23;

## İdeoloji Təhrif Mövla Təbriki

Əgər bura qədər qeyd etdiklərimiz müəyyən mənada diqqətsizlik və ya təcrübəsizlik üzündən baş vermiş xətaların misallarıdırsa bundan sonra qeyd edəcəyimiz misallar isə birbaşa ideoloji təhriflərdir. Bunun üçün çox misal vermək olar.

Müəllif kitabdakı 1-ci rəvayətin tərcüməsini bu cür qeyd edir: "**İbnul-Museyyib deyir: Səd ibn Əbu Vəqqasa dedim ki, səndən bir şey haqqında soruşmaq istəyirəm, lakin heybətindən qorxuram." Səd dedi: "İstədiyini soruş, mən sənin əminəm." Dedim: "Qədirxum günü Peyğəmbərin aranızdakı vəziyyəti haqqında soruşmaq istəyirəm." Sad dedi: "Bəli, Peyğəmbər günorta vaxtı ayağa durdu və Əlinin əlindən tutub dedi: "Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır. Ey Allahım, onunla dost olana dost ol, düşmən olana da düşmən!" Bunun ardından Əbu Bəkr və Ömər dedilər: "Ey Əbu Talibin oğlu, bütün imanlı kişi və qadınların başçısı (əmiri) oldun!**" Sitatın sonu. Bilmək lazımdır ki, bu mətnin ərəbcəsində Əbu Bəkr və Ömərə nisbət edilən sözdə "mömin kişi və qadınların mövlası oldun" cümləsi keçməkdədir, yəni hədisdə həm Peyğəmbərimizin - aleyhissalətu vassələm - dediklərində, həm də Əbu Bəkr və Ömərə nisbət edilən cümlədə eyni söz, yəni "mövla" sözü keçməkdədir. O zaman hədisin bir yerində "mövla" sözünü olduğu kimi saxlayıb digər yerində onu "başçı", "əmir" olaraq tərcümə etmək hansı məntiqə xidmət edir?! Kitabı oxuyan cahil müsəlman elə düşünəcək ki, həqiqətən də bu mətndə keçən söz ərəb dilində "başçı" və "əmir" sözləridir, xüsusilə də mötərizədə əslən ərəbcədən gəlmiş "əmir" sözünü yazmaq bu mənanın üstünə vurğu edir. Bilmək lazımdır ki, bu, ideoloji bir təhrifdir, müəllif öz etiqadına xidmət edəcək şəkildə hədisin mətnini təhrif edir və özü gözəl bilir ki, burada ümmətin böyük əksəriyyəti - o cümlədən ərəb dilinin nəhəngləri sayılacaq alimlər "mövla" sözünü "başçı", "əmir" mənasında başa düşmürlər. Ona görə də tərcümə işində bu

reallığa hörmət göstərib hədisin mətnini olduğu kimi saxlamamaq, əksinə onu tərcüməçinin etiqadına uyğunlaşdırmağa çalışmaq bir təhrifdir. Üstəlik müəllif burada açdığı qeyddə yazır: "**Böyük ehtimal, Zəhəbi sabit olmayıb deyərkən hədisin məzmununu nəzərdə tutub, çünki hədisdə Əbu Bəkrin və Ömərin Peyğəmbərin xütbəsindən sonra həzrət Əlini bütün müsəlmanların mövlası olması münasibətilə təbrik etdikləri qeyd olunub. Aydındır ki, burada söhbət dostluqdan getmir. Elə olsaydı, Əbu Bəkr və Ömər həzrət Əlini təbrik etməzdilər, çünki bu hökm onsuz da Quranda keçir və burada təbrik ediləsi heç bir şey yoxdur. Zəhəbi hədisdən anlaşılan bu mənanı yaxşı başa düşdüyü üçün onun sabit olmadığını yazır. Onun bu yanaşması obyektiv deyil və burada məzhəb təəssübkeşliyinin olduğu açıq-aşkar görünür.**" Sitatın sonu. Müəllifin burada yer verdiyi spekulyasiyaların hamısı əsassız və mənasızdır, bu Təbriz müəllimin əz-Zəhəbinin qəlbindən sitat gətirdiyi tək yer deyildir, bu cür bir-çox yerdə alimin beynini oxumağa çalışır. Lakin bütün bunlar yersizdir, çünki əz-Zəhəbi özü hədisin sabit olmamağının səbəbini izah edib və deyib: "Sabit deyildir; orada (yəni sənədində) tənqid olunmuş şəxslər var."[43] Həqiqətən də sənədindəki İbrahim bin əl-Valid bin Həmməd, atası və Hərb bin Sabih məchul ravilərdir, Yəhya bin Yalə əl-Əsləmi isə zəif ravidir. Ona görə də burada bu versiyanın sabit olmamasını söyləməkdə qəribə heç bir şey yoxdur. Müəllifin bunu qəribə qarşılaması özü qəribədir. Çünki belə görünür ki, müəllif başa düşməyib ki, burada mütəvatir olan məhz "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır" ləfzidir. Rəvayətlərdə keçən digər ləfzlərin də sabit olub olmadığını bilmək üçün isnadları yoxlamağımız lazımdır. Bu barədə və müəllifin mütəvatir haqqındakı xətalı təsəvvürü haqqında aşağıda bir qədər məlumat vermişik.

## Əbu Bəkr və Ömər orada idimi?

89-cu rəvayətin mətnini (səh: 142) müəllif bu cür tərcümə edib: "**Abdullah ibn Məhəmməd ibn Əqil Cabirdən rəvayət edir: "Qədirxumda Cöhfədə Peyğəmbərlə bir yerdə idik. Peyğəmbər gəldi, Əlinin əlindən tutub**

[43] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 14;

**qaldırdı və dedi: "Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır. Ey Allahım, onunla dost olanla dost ol, düşmən olanla düşmən!" Mən dedim: "Səni Allaha and verirəm, sonra Əbu Bəkr və Ömərmi oldu?" Dedi: "Xeyr!" Zəhəbi yazır: "Bu, həsən hədisdir.**" Növbəti səhifədə bu cümləyə şərh verərək bunu belə izah edir: "**Cabir bin Abdullah Peyğəmbərin Əlini mövla kimi təqdim etdiyini rəvayət etdikdən sonra ondan soruşurlar ki, Peyğəmbər Əlidən sonra Əbu Bəkrin və Ömərin də adlarını çəkdimi? Cabirin bu suala cavabı mənfidir; onlardan heç birinin adını çəkməyib.**" Çox əcaib bir mənzərə alınıb, hədisin mətnini tanınmaz və mənasız şəkildə təhrif etdikdən sonra müəllif ona öz etiqadına uyğun şəkildə yeni bir don geyindirməyə çalışır. Doğrusu mətndə Cabirə verilən sual belə tərcümə olunmalı idi: "Səni Allaha and verirəm, Əbu Bəkr və Ömər orada idilərmi?" Dedi: Xeyr!" Bu, mətnin zahirindən çox aydın şəkildə anlaşılır. Müəllifin bu cür tərcümə etməyinə mane olan səbəb isə budur ki, ona görə Əbu Bəkr və Ömər axı orda olublar, ona görə də necə ola bilər ki, Cabir onların orada olmadığını desin. Təbriz Qasımov müəllimin anlaması lazımdır ki, tərcüməçinin birinci vəzifəsi mətnləri ərəb dilində anlaşılan mənaya uyğun şəkildə tərcümə etməkdir, onları hansısa bir "tarixi təsəvvürə" uyğun şəkildə tərcümə etmək bu vəzifəyə daxil deyildir. Çünki ola bilsin ki:

1. Əbu Bəkr və Ömər orada iştirak etsə də Cabir bundan xəbərsiz olub,
2. Yaxud da Cabir ümumiyyətlə belə bir söz deməyib, hədisi rəvayət edən ravi xəta ilə bunu Cabirə nisbət edib
3. Yaxud da ola bilər ki, Cabir haqlıdır və Əbu Bəkr ilə Ömər həqiqətən də orda olmayıblar.

Doğru olan budur ki, Əbu Bəkrin və Ömərin Qədirxumda Əlini təbrik etməsi ilə bağlı gəlmiş xəbərlərin heç birinin isnadı səhih deyildir. Üstəlik Təbriz müəllim bir qədər əziyyət çəkməli və kitab təhqiq edən mütəxəssislərin çap etdikləri kitablarda burada "səmmə" sözünü necə yazdıqlarına diqqət etməli idi. Əgər diqqət etsəydi etdiyi tərcümənin bir təhrif olduğunu dərk edərdi. Ona görə də bütün bu ideoloji təhrifdən sonra çıxarılan nəticələrin də batilliyi isbatını tapır. Müəllifin çıxardığı nəticə budur: "**Cabir bin Abdullah Peyğəmbərin Əlini mövla kimi təqdim etdiyini rəvayət etdikdən sonra ondan soruşurlar ki, Peyğəmbər Əlidən sonra Əbu Bəkrin və Ömərin də adlarını çəkdimi? Cabirin bu suala cavabı mənfidir; onlardan heç birinin adını çəkməyib. Bu hədis Peyğəmbərin Əli haqqında söylədiyi "mövla" və "vəli" sözləri ilə, əslində, nəyi və hansı mənanı qəsd etdiyini açıq-aşkar**

**göstərir. Burada məqsəd hansısa hadisədə həzrət Əlidən inciyən şəxslərə onu möminlərin dostu, köməkçisi olaraq təqdim etmək olsaydı, onda sual verən şəxsin Əbu Bəkr və Ömərin adlarını xüsusi olaraq çəkməsi heç bir məna kəsb etməzdi, çünki qeyd olunan versiyaya əsasən onların başlarına belə bir iş gəlməyib ki, sual verən şəxs onlar haqqında da maraqlansın. Bütün bunlar hədisdə keçən "mövla" sözünün rəhbər mənasına dəlalət etdiyinə dair müddəanı daha da gücləndirir.**" Sitatın sonu. Xeyr! Əslində bu müddəaya xidmət etmək əvəzinə onun nə qədər mənasız əsaslar üzərində qurulduğunu göstərir, çünki bütün bu söz oyunları rəvayətin mətninin təhrif edilmiş forması üzərində qurulub. Üstəlik hətta tərcümənin doğru olduğunu fərz etsək belə yenə də müəllifin çıxardığı nəticə xətalıdır. Çünki bu sualı Cabirə verdikləri zaman Cabir artıq çox yaşlanmış biri idi, Cabir sual verənə qısa şəkildə Peyğəmbərin Əli haqqında fəzilət ifadə edən bir sözünü rəvayət edir və - Təbriz müəllimin tərcüməsinə görə - sual verən bunu eşitdikdə soruşur ki, "bəs Əbu Bəkri və Öməri orada zikr etdimi?" Cabir də guya bu sualın cavabında "xeyr" deyir. Axı sual verən Peyğəmbərin zamanında yaşayıb hadisələrə şahid olmuş bir şəxs deyildir ki, o, Peyğəmbərin o sözü nə üçün dediyi haqqında dolğun məlumata sahib olduğunu fərz edərək onun verdiyi sualdan bu cür nəticələr çıxaraq. Sual verənin ağlında əslən Peyğəmbərin - salləllahu aleyhi va əlihi va səlləm - həmin sözləri hansı məzmunda deməsi barədə heç bir məlumat yoxdur. Ona görə də istənilən halda müəllifin çıxardığı nəticənin batilliyi çox aşkardır.

## əz-Zəhəbinin münkər hökmü

91-ci rəvayəti müəllif bu şəkildə təqdim edir: "**Səid bin Cubeyr ibn Abbas'dan qopuq sənədlə belə nəql edir: "Əli - mövlası olduğum hər kəsin mövlasıdır." Zəhəbi yazır: "Bu, münkər hədisdir.**" Daha sonra müəllif bu barədə öz qeydini əlavə edir: "**Zəhəbinin bu hədisi münkər hesab etməsi qəribədir. Ötən bəhslərdə izah vermişdim ki, hədis ya sənəd, ya da məzmun etibarilə münkər hesab oluna bilər. Bu hədisin sənədi qopuqdur, lakin digər hədislərlə birlikdə mütəvatir həddə çatdığı üçün artıq hədisin sənədindəki bu qopuqluq heç bir problem yaratmır. Yerdə qalır məzmun.**

**Ola bilsin ki, Zəhəbi münkər sözünü hədisin mətni üçün istifadə edir. Əgər elədirsə, onda belə çıxır ki, Zəhəbinin özü də hədisdə keçən "mövla" sözünü rəhbər, başçı olaraq başa düşüb, çünki onu dost, köməkçi olaraq anlasaydı, onda hədisi münkər hesab etmək üçün heç bir əsas qalmır. Belə ki, Peyğəmbərin dostu olan hər bir kəs həzrət Əlinin də dostudur**." Sitatın sonu. Bu izahatları oxuduqda təəccübümü boğa bilmədiyim üçün bu hissəni təkrar oxudum, amma ilkin təəssüratımı dəyişdirə bilmədim. Həqiqətən də müəllifin burada oxucusuna satmaq istədiyi fikir həddindən artıq yalnış və batildir. Bunu görmək heç cür çətin olmamalıdır. Diqqət edək, İbn Abbasa nisbət edilən mətn belədir: "Əli - mövlası olduğum hər kəsin mövlasıdır." Hədisin məşhur mətni isə belədir: "Mən hər kimin mövlasıyamsa, Əli də onun mövlasıdır." Məna cəhətdən arada zərrə qədər də olsun bir fərq yoxdur, görəsən əz-Zəhəbi nə üçün birinci versiyadakı "mövla" sözündən "başçı" anlamalı, lakin məşhur versiyadan isə "dost" anlamalı idi? Biz bilirik ki, əz-Zəhəbi məşhur versiyadakı "mövla" sözündən "başçı" mənasını anlamır, çünki qədirxum hədisini səhih hesab edir və onun hətta mütəvatir olduğunu göstərmək üçün bu risaləsini yazıb. Müəllifin heyrətamiz məntiqinə görə əz-Zəhəbi əgər bu hədisə münkər deyirsə deməli mütləq buradakı "mövla" sözündən "başçı" mənasını başa düşdüyü üçün deyir. Xeyr! əz-Zəhəbi'nin münkər deməsinin səbəbi budur ki, bu rəvayətin isnadında yalanda ittiham olmuş ravi yer alır. Əgər müəllif rəvayətin isnadını düşürməsəydi və olduğu kimi versəydi oxucular əz-Zəhəbinin mövqeyini anlayardılar. Belə ki, əz-Zəhəbi deyir: "Abdulğaffər bin əl-Qasim bin Qeys - tərk olunmuşlardan biri - Adiyy bin Səbit'dən, o da Said bin Cubeyr'dən, o isə İbn Abbas'dan mərfu olaraq (rəvayət edir) ki, (Peyğəmbər) dedi: "Əli - mövlası olduğum hər kəsin mövlasıdır."[44] Gördüyünüz kimi Abdulğaffər tərk olunmuş bir ravidir, ona görə də onun bu rəvayəti Said bin Cubeyr yolu ilə İbn Abbas'dan rəvayət etməsi münkərdir, çünki ondan başqa heç kim bu rəvayəti bu ləfz ilə, bu isnad ilə İbn Abbasdan rəvayət etmir. Mühəddislər bu cür rəvayət yollarına münkər deyirlər. Müəllifin rəvayətin qopuq sənədini hədisin mütəvatirliyi ilə bərkitməyə çalışması isə bir başqa müsibətdir, çünki hər şeydən əvvəl hədisin sənədində qopuqlu yoxdur; yuxarıda izah etdiyimiz kimi müəllif "mərfu" sözünü yanlış anladığı üçün bu cür gərəksiz izahlara məcbur qalır. İkincisi isə bir hədisin mətninin mütəvatir olması onun bütün rəvayət yollarına səhihlik qazandırmır, çox təəssüf ki, Təbriz

[44] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 84-85;

müəllim bu nöqtədə kitabında tez-tez fənn ərbabının anlayışına tamamilə zidd olan izahlar verir.
Ümumiyyətlə kitabın müqəddiməsində “mövla” sözü ilə bağlı çox qeyri-adi analizlər aparılıb. Mövla sözünün fərqli təfsirlərdə “himayədar”, “köməkçi”, “qoruyucu”, “bağışlayan” kimi izahlarını təqdim etdikdən sonra Təbriz müəllim bunu “rəhbərlik”, “başçılıq” mənaları ilə əlaqələndirməyin innovativ yollarını göstərir. Bütün bunlar göstərmək istəyir ki, “mövla” sözündə “itaət olunma” mənası var. 35-ci səhifədə yazır: “**Qeyd olunan nümunələrdən bu nəticəyə gəlirik ki, ayədə keçən “mövla” sözündən məqsəd Allahın hər şeyin sahibi, yaradanı olduğuna görə yaratdıqları ilə istədiyi kimi davrana bilməsidir. Allahın onları qoruması, kömək edə bilməsi məhz buradan qaynaqlanır. Allah hər şeyin sahibi olduğuna görə dolayısı ilə onlara özlərindən daha yaxındır, yəni daha artıq ixtiyar sahibidir.**” Bu cür izahlarda kitabın müəllifi oxucuda elə təəssürat yaratmağa çalışır ki, “mövla” sözündə insanları idarə etmək, onlardan itaət tələb etmək tələbləri var. Misal üçün 37-ci səhifədə yazır: “**Buna görədir ki, Qurtubi ayədəki mövla sözünü “köməkçi” deyil, “kömək etməyi və qorumağı öhdəsinə götürən, yerinə yetirən kəs” olaraq izah edir. Bu izah həm sözün leksik mənası ilə, həm də ayənin konteksti ilə daha uyğun gəlir. Allah sizin mövlanızdır, yəni sizə ən yaxın olan varlıq Odur, deməli, Ona itaət etsəniz, O sizi təhlükələrdən qoruyacaq və kömək edəcək. Onu da əlavə edim ki, “mövla” sözünü hətta köməkçi mənasına yozsaq belə, arada ciddi bir fərq yaranmır, çünki kömək etmək, üstəlik, köməkçilərin ən yaxşısı olmaq digərlərində olmayan bir sıra məziyyətlərə sahib olmağı tələb edir. Bu da nəticədə kömək edənin ən üstün olduğuna və beləcə, digərlərinin ona itaət etməsi gərəkdiyinə dəlalət edir.**” Sitatın sonu. Əgər diqqət etsək görəcəyik ki, kitabın müəllifi demək istəyir ki, “mövla” sözü “köməkçi” mənası versə də Allahın köməkçi olması Onun mütləq idarə edən olmasına görədir. Bu yolla kitabın müəllifi “mövla” sözünə idarəçilik, itaət tələbi kimi mənalar aşılamağa çalışır. Bəli, Allah əgər Bağışlayandırsa bunu yalnız hər şeyin mütləq maliki olduğu üçün edə bilir, güc və izzət sahibi olduğu üçün edə bilir, hər şeyin idarəsini və tədbirini əlində tutduğu üçün edə bilir, lakin bu yenə də “bağışlayan” (ğafur) sözünə başqa bir məna qatmayacaq, bağışlayan sözündə “idarə edən”, “rəhbər”, “başçı” mənaları olmayacaq. “Bağışlayan” sözü elə “bağışlayan” mənasını verəcək. Bütün bu dolayı yollarla edilən izahların hamısı psixoloji həmlələrdir, real elmi bir dəyərləri yoxdur.

Müəllifin 41-ci səhifədəki sözləri isə həddindən artıq təhlükəli ifadələrdir: "**Lakin yuxarıdakı ayədə mövzu Allahın vilayəti olduğuna görə orada işlənən "vəli" kəlməsindən məqsədin rəhbər, başçı olduğu aydın olur**." Xeyr, aydın olmur! Ümumiyyətlə aləmlərin yaradıcı Allah heç bir şəkildə "rəhbər", "başçı" olaraq vəsf olunmaz, Allahu təalə kütlələrə rəhbərlik etmir. Haşa! Onun haqqında "rəhbər", "başçı" demək Onun dəyərini kiçiltmək, Onu aciz insanlar kütlələrinə rəhbərlik edən hökmdarlara bənzətməkdir. Çox üzücü haldır ki, həzrət Əlinin məqamını məsum bir rəhbər səviyyəsinə qaldırmaqdan ötrü Allahın məqamı rəhbər səviyyəsinə qədər kiçildilir.

Eyni səpkidə gətirdiyi primitiv arqumentlərdən biri də 47-ci səhifədə "**Hədislərdə mövla və vəli sözlərinin mənası" başlığı altında dediyi bu sözlərdir: "Qurandan fərqli olaraq hədislərdə bu sözlər həm məna cəhətdən daha aydın istifadə edilib, həm də onların insanlar haqqında işləndiyini görmək mümkündür. Bu da, təbii ki, "mövla" və "vəli" kəlmələrinin mənası barədə insanlarda daha aydın təsəvvür yaradaraq onların insanlar barəsində istifadə edilərkən yalnız dost, köməkçi deyil, eyni zamanda rəhbər, hakim, səhahiyyətli şəxs mənasında işləndiyini göstərir. Burada nümunə olaraq bir neçə hədis qeyd edəcəyəm. İlk nümunə "Səhihul-Buxari" kitabındandır. Hədisin özünü qeyd etməmişdən əvvəl Buxarinin bu hədis üçün seçdiyi başlığa diqqətinizi çəkmək istəyirəm. Başlıq belədir: "Sultanın vəli olması babı". Gördüyünüz kimi, Buxari sultanı vəli olaraq vəsf edir. Aydındır ki, burada vəlidən məqsəd dost, köməkçi deyil. Məqsəd onun rəhbər, hakim, səlahiyyətli şəxs olmasıdır. Buxarinin belə bir başlıq seçməsinə səbəb isə nəql etdiyi hədisdir**." Daha sonra Təbriz müəllim Peyğəmbərin - aleyhissələm - özünü ona hibə etmiş bir qadını səhabələrdən bir kimsəyə ərə verməsi barədə hədis zikr edir və deyir: "**Gördüyünüz kimi, Buxari bu hədisdən Peyğəmbərin həmin şəxsləri evləndirmək səlahiyyətinə sahib olduğu nəticəsini çıxarır və bu hökmü Peyğəmbərdən sonra gələn vəlilərə, əmr sahiblərinə də şamil edir**." Burada Təbriz müəllimin gətirdiyi arqumentin primitivliyi odur ki, burada "vəli" sultan olaraq vəsf olunmur, sultan vəli olaraq vəsf olunur. Bu, vəli sözündə hakimiyyət mənasını ifadə etmir. Vəli bu kontekstdə qəyyum mənasındadır. Bir qadının atası, babası yoxdursa ona oğlu "vəli" ola bilər, yaxud da əmisi oğulları onun üçün "vəli" ola bilərlər. Burdan heç kim belə bir məna çıxarmır ki, ananın öz oğluna itaət etməsi lazımdır. Buradakı vəlilik kimisə idarə etmək mənasında deyildir, sadəcə

olaraq həmin şəxsin maraqlarını təmsil etmək mənasındadır. əl-Buxari'nin "sultan vəlidir" deməsi vəli sözünə "hakim", "başçı" mənası yükləməz, əks təqdirdə o cümlə mənasız cümlə olardı, çünki "sultan" sözü onsuz da özlüyündə hakim və başçı mənalarına dəlalətində "vəli" sözündən daha aşkardır. Ona görə də dəlaləti daha aşkar olan bir sözü dəlaləti daha zəif olan bir sözlə izah etmək hikmətdən deyildir. Allahın elçisi - aleyhissalətu vassələm - bir hədisində buyurur ki, "İmam yalnız bir cunnətdir (sipərdir, qalxandır); onun vasitəsilə vuruşular və (xalq) onun arxasında qorunar."[45] Peyğəmbərin bu hədisini kimsə oxuyub "cunnət" (qalxan, sipər) sözündə hakimlik, rəhbərlik mənalarının olduğunu iddia etsə o adam haqqında heç də yaxşı fikir sahibi olmarıq. Ona görə də bu şəkildə hədislərdən orada olmayan mənaları çıxarmaq yaxşı bir üslub deyildir.

Üstəlik "mövla" sözü Quranda və sünnətdə konkret olaraq başçı, idarəçi mənasında keçmir. Biz iltizəm dəlaləti ilə bu mənanı çıxarmaqdan danışmırıq, biz birbaşa mutabəqa dəlaləti ilə belə bir mənanın olduğunu deyirik. Həqiqət budur ki, yoxdur. Əksinə Qurana və sünnətə baxdığımızda "mövla" sözünün tamamilə başqa mənalarda işləndiyini görürük. Qurana gəldikdə burada mövla sözünün Allah üçün işlənən mənası ilə insanlar üçün işlənən mənasını ayırmaq lazımdır. Allah üçün mövla sözü ən çox "himayədar, köməkçi" mənalarında gəlir. Bununla yanaşı "mütləq sahib, malik" mənalarını da ifadə edən yerlər vardır. Himayədar mənasında gələn yerlədən ən aşkarı Muhəmməd surəsində keçir: "Çünki Allah iman gətirənlərin mövlasıdır. Kafirlərin isə heç bir mövlası yoxdur."[47:11] Şübhəsiz ki, burada "sahib, işləri idarə edən" mənası qəsd oluna bilməz, çünki Allah həm möminlərin, həm də kafirlərin sahibi, işlərini idarə edəndir. Təhrim surəsində də bu mənada buyurur: "Əgər Peyğəmbərə qarşı bir-birinizə arxa olsanız, bilin ki, onun mövlası Allah, Cəbrail və saleh möminlərdir. Bunlardan savayı mələklər də onun yardımçılarıdır."[66:4] Burda da başa düşürük ki, idarə edən ola bilməz, əks təqdirdə "saleh möminlər" Peyğəmbəri idarə edən kəslər olacaqlar. Möminlərə öyrətdiyi duada da eyni məna keçir: "Bizi bağışla! Bizə rəhm et! Sən mövlamızsan! Kafirlər qövmünə qarşı bizə yardım et!"[2:286] Ayədə Allahın mövla olması vəsf olunduqdan sonra "fə" hərfi keçir və bununla da sonrakı hissəni özünə bağlayır, yəni "Allah Mövla olduğu üçün kafir qövmə qarşı möminlərə yardım edir." Bu da himayə mənasındadır. Digər ayələrdə də məna buna yaxındır,

[45] "Sahih əl-Buxari", 2957; "Sahih Muslim", 1835

belə ki, bir ayədə buyurur: "Əgər onlar (iman gətirməkdən) üz döndərsələr, bilin ki, Allah sizin mövlanızdır. O nə gözəl mövladır və nə gözəl yardımçıdır!"[8:40] Yenə buyurur: "Elə isə namazı qılın, zəkatı verin və Allaha sarılın (güvənin)! O, sizin mövlanızdır. O nə gözəl mövla və nə gözəl yardımçıdır!"[22:78] Bu yerlərdə "yardım və kömək" ilə yanaşı gəldiyi üçün buradakı mənada "himayə və qayğı" anlaşılmalıdır. Çünki ayə "nə gözəl mövla" dediyi üçün burada möminlərə qayğının olması aşkardır, mücərrəd olaraq işləri idarə etməyin özlüyündə neytrallıq var, amma himayədə isə qayğı mənası daha aşkardır. Yenə buyurur: "Əksinə, sizin mövlanız Allahdır və O, yardım edənlərin ən xeyirlisidir."[3:150] Burda da gördüyümüz kimi mövla sözü "yardım edənlərin ən xeyirlisi" məntiqini dəstəkləyəcək şəkildə işlədilib. Tövbə surəsində isə deyir: "De: "Allahın bizim üçün yazdığından başqa bizim başımıza heç nə gəlməz. O bizim Mövlamızdır. Qoy möminlər Allaha təvəkkül etsinlər!"[9:51] Burada Allaha təvəkkül mənası ilə eyni məzmunda gəldiyi üçün "himayədar" mənası daha aşkardır. Təhrim surəsində buyurur: "Allah, andlarınızdan (kəffarə verməklə) azad olmağı sizdən ötrü qanuniləşdirmişdir. Allah sizin mövlanızdır. O, Biləndir, Müdrikdir."[66:2] Bu ayədə də Allah öz bəndələrinə qayğısını ifadə edir, çünki qoyduğu qanunları insanlardan ötrü qoyduğunu ifadə edir. Başqa ayələrdə isə dediyim kimi mövla sözü mütləq sahib, mütləq hakim mənsında keçir. Misal üçün bir ayədə deyir: "Sonra onlar Allaha – özlərinin həqiqi Mövlalarına qaytarılacaqlar. Hökm yalnız Ona məxsusdur və O, ən tez haqq-hesab çəkəndir."[6:62] Yunus surəsində isə deyir: "Orada hər bir nəfər keçmişdə törətdiklərinin acısını çəkəcəkdir. Onlar Allaha – özlərinin həqiqi Mövlalarına qaytarılacaq- və uydurduqları (bütlər) onlardan uzaqlaşıb qeyb olacaqlar."[10:30] Insanlarla bağlı Quranda mövla sözü bir neçə mənada gəlir. Bəzən "ağa" mənasında keçir. Misal üçüm bir ayədə buyurur: "Allah eləcə də iki kişi barəsində məsəl çəkdi; Onlardan biri laldır, heç bir şeyə gücü çatmır və öz ağasına (mövlasına) bir yükdür. Onu hara yollasa, xeyirlə qayıtmaz. Məgər doğru yolda olub ədalətli işlər görməyi əmr edən bir kimsə ilə belə bir adam eyni ola bilərmi?"[16:76] Bəzən isə mövla dost mənasında keçir. Duxan surəsində deyir: "O gün mövlanın mövlaya heç bir faydası olmayacaq və onlara heç birköməklik də göstərilməyəcəkdir."[44:41] Yəni dostun dosta heç bir faydası olmayacaq. Nisa surəsində bu söz varis mənasında keçir: "Ata-ana və yaxın qohumların qoyub getdiklərindən də hər bir kişi və qadın üçün varislər (mövlalar) təyin etdik. Əhd bağladığınız

şəxslərin paylarını da özlərinə verin! Şübhəsiz ki, Allah hər şeyə şahiddir."[4:33] Məryəm surəsində isə "mövla" sözü qohumlar mənasındadır. "Doğrusu mən özümdən sonra gələn qohumlarımdan (mövlalardan) qorxuram. Zövcəm də qısırdır. Ona görə də Öz tərəfindən mənə bir dost (oğul) ver!"[19:5] Əhzab surəsində isə "mövla" sözü yaxın insan, dost mənasındadır: "Onları (oğulluğa götürdüyünüz uşaqları) öz atalarının adları ilə çağırın! Allah nəzdində bu daha ədalətlidir. Əgər onların atalarının kim olduğunu bilmirsinizsə, onları din qardaşlarınız və yaxınlarınız (mövlalarınız) olaraq görün."[33:5]

Hədislərə gəldikdə görürük ki, mövla sözü yenə də bu şəkildə fərqli mənalarda işlənib. Misal üçün Mə'mər bin Raşid'in Həmməm bin Munəbbih'dən, onun da Əbu Hureyra'dan rəvayət etdiyi bir hədisdə Allahın elçisi - salləllahu aleyhi va səlləm - deyir: "Sizdən biriniz "rəbbini yedizdir!" "rəbbinə su ver!" "rəbbinə dəstəmaz aldır!" deməsin, qoy "seyyidim (ağam) və mövlam" sözlərini işlətsin. Sizdən biriniz "abd və əmə" (kişi və qadın kölə) deməsin, qoy "fətə, fətət və ğuləm" sözlərini işlətsin!"[46] Əbu Əyyub əl-Ənsari'nin rəvayət etdiyi hədisdə Allahın rasulu - salləllahu aleyhi va səlləm - deyir: "Ənsar, Müzeynə, Cüheynə, Ğifar, Əşcə və Bəni Abdullahdan olanlar başqalarının deyil, mənim mövlalarımdır. Allah və Onun Rəsulu onların mövlasıdır."[47] Əbul-Abbas əl-Qurtubi "başqalarının deyil, mənim mövlalarımdır" sözünün şərhində deyir: "Mən onların yardımçısıyam və işlərinin hamısını öz öhdəmə götürürəm. Buna görə də onların öz işlərində məndən başqasına üz tutmaları yaraşmaz."[48] Bir başqa hədisdə buyurur: "Elə bir mömin yoxdur ki, mən bu dünyada da, axirətdə də ona öz canından daha yaxın olmayım. İstəsəniz, bu ayəni oxuyun: «*Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır*» [33:6] Hansı mömin vəfat edərsə və mal qoyub gedərsə, onun mirasını ata qohumları alsın. Amma əgər borc və ya kimsəsizlər qoyub gedərsə, onda qoy mənə gəlsin – mən onun mövlasıyam."[49] əl-Bəra bin Azib'in rəvayət etdiyi hədisdə deyir: "Peyğəmbər – salləllahu aleyhi və səlləm – ümrə üçün Məkkəyə daxil oldu. Müddət bitdikdən sonra, Məkkəlilər Əliyə gəlib dedilər: "Dostuna (yəni Peyğəmbərə) de ki, artıq müddət başa çatdı, bizim aramızdan çıxıb getsin." Peyğəmbər – salləllahu aleyhi və səlləm – Məkkədən çıxdı. Bu zaman Həmzənin qızı

[46] Abdurrazzəq, "əl-Musannəf", 10/121; ət-Təsil əs-Səniyə çapı.
[47] "Sahih Muslim", 2519;
[48] əl-Qurtubi, "əl-Mufhim limə Əşkələ min Təlxis Kitəb Muslim", 6/474;
[49] "Sahih əl-Buxari", 2399; "Sahih Muslim", 1619;

onların ardınca düşüb qışqırdı: “Ey əmi! Ey əmi!” Əli – aleyhissələm – onun əlindən tutdu və Fatiməyə – aleyhasələm – dedi: “Bu, sənin əmin qızıdır – onu götür.” Sonra **Əli**, **Zeyd** və **Cəfər** onun kimə verilməsi məsələsində ixtilafa düşdülər: Əli dedi: “O, mənim haqqımdır, çünki əmimin qızıdır.” Cəfər dedi: “O, həm mənim əmimin qızıdır, həm də xalası mənim evimdədir (yəni arvadım onun xalasıdır).” Zeyd dedi: “O, mənim qardaşımın qızıdır.” Peyğəmbər – salləllahu aleyhi və səlləm – onun xalasına verilməsinə qərar verdi və buyurdu: “Xala, ana kimidir.” Sonra Əliyə – aleyhissələm – buyurdu: “Sən məndənsən və mən də səndənəm.” Cəfərə buyurdu: “Sən həm zahiri görünüşdə, həm də əxlaqda mənə bənzəyirsən.” Zeydə isə buyurdu: “Sən bizim qardaşımız və mövlamızsan.”[50] Allahın elçisinin köləsi olmuş, sonra azad etdiyi Əbu Rafi deyir: “Peyğəmbər - salləllahu aleyhi va səlləm - Bənu Məxzumdan gələn sədəqə üçün bir nəfəri göndərir; o da Əbu Rafi’yə deyir: “Mənə yol yoldaşı ol, sənə də ordan bir şey nəsib olar.” Dedi: “Gedib Peyğəmbərdən - salləllahu aleyhi va səlləm - soruşmalıyam.” Gəlib ondan soruşdum və o dedi: “Qövmün mövlası da onlardandır, bizə isə sədəqə halal deyildir.”[51] Bir hədisdə gəlir ki, Ubədə bin əs-Samit gəlib deyir: “Ey Allahın Rəsulu! Mənim yəhudilərdən olan çoxlu sayda mövlalarım var - sayları çoxdur, gözüm onlara çatmır. Mən isə Allah və Onun Rəsulu qarşısında yəhudilərlə vilayətdən uzaq olduğumu bildirirəm.”[52] Bütün bu misallar onu göstərir ki, “mövla” sözü fərqli mənalarda işlənib, lakin bunların heç birində - nə Quranda, nə də sünnətdə - mövla sözü birbaşa dəlalət olaraq “hakim”, “hökmdar”, “dövlət başçısı”, “xəlifə”, “əmir” mənasında gəlmir. Təbriz müəllim bunu gözəl başa düşdüyü üçün verdiyi bütün misallarda “mövla” sözünə belə bir məna yükləmək üçün dolayı bağlar və əlaqələr ortaya qoymalı olur. Bu əslində əhlüs-sünnətin dediyini təsdiqləyir. Əhlüs-sünnət də təbii olaraq belə bir sual verir ki, insanların ən fəsahətlisi olan Allahın elçisi - aleyhissalətu vassələm - necə olur ki, belə əhəmiyyətli bir məsələdə aydın bir ifadə işlətməyib?!

50 “Sahih əl-Buxari”, 2699, 4251
51 “Sunən Əbi David”, 3/88 (1650); “Musnəd Əhməd”, 39/289 (23863) İsnadı səhihdir.
52 İbn Əbi Şeybə, “əl-Musannəf”, 6/391 (32301); əl-Hut çapı.

## Mütəvatir sözündən sui-istifadə

Müəllifin kitabında bir çox yerdə təkrarladığı batil bir metod var. Bu misallardan bəziləri ilə tanış olaq. Misal üçün 83-cü səhifədə yazır: "**Hədis mütəvatir olduğuna görə onun sənədinə irad bildirmək, üstəlik, sabit olmadığını söyləmək ağlabatan deyil.**" 94-cü səhifədə də yazır: "**Lakin hədisin sənədinə dair bu irad onu etibarsızlaşdırmır, çünki hədisin sənədi mütəvatirdir.**" 101-ci səhifədə isə yazır: "**Zəhəbinin nəql etdiyi bu hədis mütəvatir olduğuna görə, deməli, iki hədisdən birinin məzmununda nəsə anlaşılmazlıq yaranarsa, onda mütəvatir olan mətn əsas tutulmalıdır. Mütəvatir hədis əsas tutulduğuna görə, deməli, "Peyğəmbər özündən sonra Əhli-beyti, sadəcə, tövsiyəmi edib, yoxsa onları Quranla yanaşı insanlara düz yolu göstərən bir vasitə olaraqmı təyin edib?" sualına veriləcək ən düzgün cavab şühəsiz ki, ikinci versiya olacaq.**" 112-ci səhifədə bir daha yazır: "**Yuxarıda qeyd olunan hədisin mütəvatir olması hədisin sənədinin məqbul olduğunu göstərir.**" 115-ci səhifədə yenə eyni məntiqi təkrarlayaraq buyurur: "**Zəhəbinin adlarını çəkdiyi ravilərin zəif və ya şübhəli olmaları hədisin sənədində heç bir problem yaratmır, çünki hədis mütəvatir olduğuna görə bəzi hədislərin sənədlərində mövcud olan bu kimi nöqsanlar hədisin mötəbərliyinə xələl yetirmir. Zəhəbinin qeyd etdiyi qüsura gəldikdə isə, qüsur ya hədisin sənədində olur, ya da mətnində. Hədisin sənədi mütəvatir olduğuna görə burada hansısa qüsurdan söhbət gedə bilməz.**" 147-ci səhifədə yazır: "**O, hədisə uzaqbaşı zəif deyə bilər. Bu da nəticədə heç bir problem yaratmır, çünki hədis mütəvatir olduğuna görə digər onlarla səhih hədis bu hədisin sənədini möhkəmləndirir və ortada onu inkar etmək üçün artıq heç bir səbəb qalmır.**" Bu misallar onu göstərir ki, kitabın müəllifinin mütəvatir haqqında tamamilə xətalı təsəvvürü var. Çünki sözlərindən belə başa düşülür ki, əgər bir hədis müəyyən bir ləfz ilə mütəvatirdirsə, o zaman onun bütün variantları - o variantlarda müxtəlif əlavələrin olmasına baxmayaraq - qəbul olunmalıdır. Misal üçün bizim müzakirəsini etdiyimiz hədisdə mütəvatir olan bu sözlərdir: "Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır." Əgər bu mütəvatir hədisin rəvayət yollarından birində hansısa isnadla bu sözlərdən sonra - "Onun sözünü eşidin və itaət edin!" əlavəsi gələrsə - Təbriz müəllimə görə - bunu qəbul etməyimiz lazımdır, inkar etmək olmaz, çünki hədis mütəvatirdir. Əgər kitabın müəllifi bunu qəsd edirsə bu, o

zaman cəhalətdən başqa bir şey deyildir, çünki mütəvatir olan konkret olaraq "mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır" ləfzidir, əlavələrə gəldikdə isə onlar mütəvatir deyildir; onların içində səhih olanlar da var, zəif, hətta uydurma olanlar da var. Mütəvatir ləfzə edilmiş əlavələrin də araşdırılmadan qəbul edilməsi gərəkdiyini nə əhlüs-sünnətdə, nə də şiə alimlərindən hansısa alimin dediyini bilmirəm. Yox, əgər bu məna qəsd olunmursa o zaman Təbriz müəllimə sual vermək lazımdır ki, əz-Zəhəbinin hədislərin fərqli versiyaları ilə bağlı verdiyi hökmlərə "hədisin mütəvatir olduğunu göstərməklə" etiraz etməyin mənası nədir? Üstəlik diqqətimizi çəkən tərəf budur ki, kitabın müəllifi tez-tez qeyd edir ki, "**hədisin sənədinə dair bu irad onu etibarsızlaşdırmır, çünki hədisin sənədi mütəvatirdir.**" Təbriz müəllimin bilməsi lazımdır ki, bir hədisin mütəvatirliyi müəyyən şərtlər çərçivəsində hasil olur və bu şərtlərdən biri rəvayət yollarının çoxluğudur. Lakin bu rəvayət yollarından hər biri ayrılıqda mütəvatir deyildir, bu rəvayət yollarından bəzilərinin xəta olması mümkündür. Ona görə də mütəvatir olan sənəd deyildir, hədisin ləfzidir. Əgər hansısa yalançı bir ravi mütəvatir bir hədisi götürüb ona öz isnadını uydurarsa və hədisin mütəvatir mətninə öz etiqadına uyğun bir şeylər əlavə edərsə, bunu qəbul etmək olmaz və hədisin kötüyünün mütəvatir olması ona edilən hər bir əlavənin də mütəvatir olmasını gərəkdirməz. Ola bilsin ki, müəllif burada bəzi hədis alimlərinin "mütəvatirdə ravilər araşdırılmaz, əksinə araşdırmadan ona əməl etmək vacibdir"[53] deməklərinə aldanıb. Lakin bu sözü deyən alimlərin qəsd etdikləri bu qayda mütəvatir olan ləfz barəsindədir və Təbriz müəllimin təkrar-təkrar "isnad mütəvatirdir" deməsi xətalıdır. Çünki mütəvatir deyildikdə qəsd olunan hədisin ləfzidir, onun isnadı deyildir. Ona görə də İbn Həcər'in bu sözlərini izah edənlər deyirlər ki, mütəvatir bəhsi hədis elminin yox, üsulul-fiqh elminin sahəsidir, ona görə də mühəddislər kitablarında mütəvatiri az qeyd edirlər. Tələbəsi əs-Səxavi deyir: "(Mütəvatir) bu fənnin araşdırma sahəsi deyil, belə ki, onun ricalı araşdırılmır, çünki ravilərin vəsflərinin bu mövzuya dəxli yoxdur. Bu səbəbdən, hədis alimlərindən yalnız az bir qismi - misal üçün əl-Hakim, əl-Xatib "əl-Kifəyə" əsərinin əvvəllərində, İbn Abdilbərr və İbn Həzm - onu (mütəvatir növünü) qeyd etmişdir... əl-Xatib onu qeyd etsə də, onun sözlərində hədis əhlindən başqalarına tabe olduğunu hiss etdirən məqamlar var. Bəlkə də bu, onun (mütəvatir növünün) onların sənətinə daxil olmaması

[53] İbn Həcər, "Nuzhətun-Nəzar", səh: 90; əl-Qasim çapı.

və onların rəvayətlərində demək olar ki, tapılmaması ilə əlaqədardır."[54] Başa düşürük ki, burada mütəvatir deyildikdə "mətn" qəsd olunur, isnad qəsd olunmur. Bizim bu dediklərimizin bəlkə də ən aşkar misalı elə Qurandır. Quran mütəvatir olaraq sabitdir, lakin bəzi ayələr barəsində rəvayətlərdə əlavə ləfzlər varid olub və biz şübhəsiz ki, Quran mütəvatir olduğu üçün ona nisbət edilmiş əlavə ləfzləri qəbul etmirik. Eyni şəkildə də Qədirxum hədisinin müəyyən ləfzi mütəvatir olsa da bunun fərqli versiyalarında xətalar var. Misal üçün bu rəvayət yollarından birində Peyğəmbərin bu sözləri Məkkədən qayıdarkən yox, Məkkəyə doğru həccə gedərkən dediyi keçir.[55] Təbriz müəllimin təqdim etdiyi məntiqə əsasən bu rəvayətin də isnadına baxmağa ehtiyac yoxdur, çünki hədis mütəvatirdir.
163-cü səhifədə isə yazır: "**Zəhəbinin son cümlədəki qeydləri çox qəribədir. Bir tərəfdən deyir ki, həmin əlavəyə dair rəvayət edilən hədislərin bəzilərinin sənədləri səhihdir. Lakin daha sonra həmin hissənin ravi tərəfindən hədisə əlavə edilə biləcəyini də yazır. Ehtimala qalsa, istənilən hədis haqqında bu ehtimal keçərlidir. Lakin heç bir din mütəxəssisi səhih hədislərə bu şəkildə münasibət bildirmir. Zəhəbi isə mütəvatir bir hədis haqqında oxucunun zehnində görün necə şübhələr oyadır.**" Sitatın sonu. Görünür ki, Təbriz müəllim burada əz-Zəhəbi'nin nə demək istədiyini anlamayıb. əz-Zəhəbi qeyd etmək istəyir ki, "Allahım, ona dost olana dost, düşmən olana düşmən ol!" sözləri səhih isnadlarla gəlib, lakin bu ləfzin mudrac olması mümkündür. Bu o deməkdir ki, isnad səhih olsa da isnaddakı ravilərdən birinin xəta edərək bu hadisəni nəql edən səhabənin etdiyi duanı Peyğəmbərin duası kimi başa düşüb hədisin mətninə əlavə etməsi mümkündür. Bu cür hədislərə mudrac deyirlər. Səhih hədislərin içində mudrac olanlar vardır və alimlər bunu hədis elmi kitablarında ciddi bir şəkildə müzakirə edirlər. Bu, ehtimal ilə hansısa hədisi zəif çıxarmaq deyildir, bu hədisi hələ də səhih saymaqla bərabər o sözlərin mərfu yoxsa məvquf olmasında ehtimalın olduğunu söyləməkdir. Təbriz müəllim əz-Zəhəbi'nin sözlərini anlamadığı üçün bu cür qarışıqlığa yol verib.

[54] əs-Səxavi, "Fəthul-Muğis", 4/16
[55] ət-Tahavi, "Şərh Müşkil əl-Əsər", 5/20;

## Xanımların Əhlul-Beytə daxil olması

123-cü səhifədə Peyğəmbərin xanımlarının əhlul-beytə daxil olub olmaması məsələsini müzakirə edərkən müəllif belə bir söz işlədir: “B**u məqamda Ümmü Sələmə də onlardan biri olub olmadığını Peyğəmbərdən soruşur, lakin Peyğəmbər ona “yox” cavabını verir.**” Daha sonra nümunə olaraq hədisi zikr edir, gəlin baxaq verdiyi nümunədə belə bir məna varmı: “**Nümunə üçün aşağıdakı hədisə nəzər salaq: “Əbu Said əl-Xudri Ümmü Sələmədən belə rəvayət edir: “Ey Əhli-beyt! Allah sizdən çirkinliyi yox etmək və sizi tərtəmiz etmək istəyir!” ayəsi nazil olanda Peyğəmbər Əlini, Fatiməni, Həsəni və Hüseyni çağırdı və xeybər əbasını onların üstünə örtdü və dedi: “Ey Allahım! Bunlar mənim Əhli-beytimdir. Onlardan çirkinliyi apar və onları tərtəmiz et!” Ümmü Sələmə dedi: “Mən də onlardanam?” Peyğəmbər dedi: “Sən xeyir üzərindəsən.” Bu hədisdən aydın olur ki, Peyğəmbərin xanımları Quranın “Əhzab” surəsində Əhli-beyt haqqında keçən ayəyə daxil deyillər.**” Sitatın sonu. Təbriz müəllimin burada necə ideoloji təhrif etdiyinə şahid oluruq, çünki verdiyi nümunədə Peyğəmbərin - salləllahu aleyhi va səlləm - “yox” cavabı verdiyini görmürük, əksinə ona müsbət bir şəkildə “Sən xeyir üzərindəsən!” deyərək cavab verir. Bu isə inkar yox, təsdiq mənasındadır. Əhlüs-sünnət qeyd edir ki, Ummu Sələmənin hədisi Əhzab surəsindəki ayə ilə tamamilə ahəng içindədir, əksinə hədislər də təsdiq edir ki, zövcələri əsalətən ayənin hökmünə daxildir. Belə ki, ayə Ummu Sələmə’nin evində nazil olub və nazil olduqdan sonra Allahın elçisi Əlini, Fatiməni, Həsəni və Hüseyni əbası altına alaraq Allaha dua edir və onların da təmizlənməsini Allahdan istəyir! Əgər ayə nazil olarkən murad Peyğəmbərin zövcələri yox, məhz bu dörd nəfər idisə o zaman Allahın elçisinin duası əbəsdir, çünki onsuz da Allah - cəllə cəlaluhu - ayədə onları təmizləmək istədiyini demişdi. O zaman Peyğəmbərin etdiyi iş artıq hasil olmuş bir şeyi təhsil etmək üçün bir cəhd olacaq ki, hikmət sahiblərinə belə bir şey yaraşmaz. Ona görə də əhlüs-sünnət qeyd edir ki, ayənin nassı ilə Peyğəmbərin - salləllahu aleyhi va əlihi va səlləm - zövcələri Əhlul-beytə daxildir və Əli, Fatimə, Həsən və Hüseyn isə Peyğəmbərin duası ilə daxil olurlar. Ummu Sələmə’dən gələn daha səhih və daha mötəbər rəvayətlər zövcələrin əhli-beytdən olduğunu təsdiqləyir. Əli bin Hucr deyir: “İsmail bizə rəvayət etdi; Şərik bizə Ata'dan rəvayət etdi ki, bu ayə Ummu Sələmə'nin evində ikən nazil oldu: "Həqiqətən, Allah yalnız sizdən, ey əhli-

beyt, çirkinliyi yox etmək və sizi tam pak etmək istəyir!" Ummu Sələmə evin bir tərəfindən dedi: "Ey Allahın elçisi, məgər mən əhli-beytdən deyiləmmi?" Dedi: "Bəli, inşallah." Sonra o, bir örtük götürdü və Fatimənin, Həsənin və Hüseynin üstünə atdı və sonra dedi: "Həqiqətən, Allah yalnız sizdən, ey əhli-beyt, günahları yox etmək və sizi tam pak etmək istəyir!"[56] Bunu həmçinin ət-Tabərani “əl-Mucəm əl-Kəbir”də, Əbu Nueym “Tarixu Əsbəhan”da, əl-Beyhəqi “əs-Sunən əl-Kubra” kitabında, əl-Bəğavi “Şərhus-Sunnə”də, İbn Asəkir “Tərixu Diməşq” kitabında rəvayət edirlər; hamısı bunu Şərik bin Əbi Nəmr vasitəsi ilə Ata bin Yəsar’dan, o da Ummu Sələmədən rəvayət edir.[57] əl-Beyhəqi rəvayəti qeyd etdikdən sonra deyir ki, Əbu Abdilləh əl-Hakim ən-Neysəburi deyib: “Bu, səhih bir hədisdir, sənədindəki ravilər siqadır.”[58] əl-Bəğavi deyir ki, “Bu, isnadı səhih olan bir hədisdir.”[59] Ona görə də İmam Əbu Mənsur əl-Məturidi təfsirində deyir: “Ummu Sələmədən nəql edilən rəvayətə gəlincə, bu xəbərdə onun zövcələrinin də (əhli-beytə) daxil olduğu açıq şəkildə bildirilməkdədir. Çünki Ummu Sələmə ona dedi: 'Mən də Əhli-Beytdən deyiləmmi?' O dedi: 'Bəli, inşallah.”[60] əl-Qadi əl-Beydavi də deyir ki, “hədis (sadəcə olaraq) onların (yəni Əlinin, Fatimənin, Həsən və Hüseynin) əhli-beytdən olduqlarını gərəkdirir, yoxsa onlardan başqalarının olmadığına dəlalət etmir.”[61] Şərəfuddin ət-Tibi də eyni sözləri təkrarlayaraq bunu əz-Zəməxşəri’nin təfsirinə yazdığı haşiyəsində qeyd edir.[62] Əbu Bəkr Abdulqahir əl-Curcəni (v. h. 471) deyir: “Bəzi rəvayətlərdə Ummu Sələmə belə demişdir: 'Mən də sənin Əhli-Beytindən deyiləmmi, ya Rəsulallah?' O dedi: 'Bəli' və onu da öz örtüyünün altına daxil etdi. Lakin (onu kisənin altına daxil etmədiyini deyən) birinci rəvayət daha məşhurdur. Əgər Ummu Sələmə’ni (kisənin altına) daxil etməmişdirsə, bu, onun Qurandakı zahir ifadə ilə kifayətlənməsinə görədir.”[63] Cəlaluddin əd-Dəvvani yazır: “Bundan əlavə, Ummu Sələmənin bu ayənin nazil olduğu zaman Peyğəmbərdən - salləllahu aleyhi va səlləm - 'Mən də Əhli-Beytdən deyiləmmi?' deyə soruşduğu və Peyğəmbərin - salləllahu aleyhi va səlləm - ona 'Sən

[56] “Hədis Əli bin Hucr”, səh: 462 (rəq: 403)
[57] ət-Tabərani, “əl-Mucəm əl-Kəbir”, 23/286; Əbu Nueym, “Tərixu Əsbəhan”, 2/223; əl-Beyhəqi, “əs-Sunən əl-Kubra”, 2/214; İbn Asəkir, “Tərixu Diməşq”, 14/138;
[58] əl-Beyhəqi, “əs-Sunən əl-Kubra”, 2/214;
[59] əl-Bəğavi, “Şərh əs-Sunnə”, 14/117 (rəq: 3912)
[60] əl-Məturidi, “Təvilət Əhl əs-Sunnə”, 8/383;
[61] əl-Beydavi, “Ənvarut-Tənzil”, 4/231;
[62] ət-Tibi, “Futuh əl-Ğayb”, 12/421;
[63] əl-Curcəni, “Dərcud-Durar fi Təfsir əl-Əy vas-Suvar”, 3/1408;

xeyirdəsən' cavabını verdiyi rəvayət, deyilənlərə zidd deyil. Çünki bu, əslində Ummu Sələmənin Əhli-Beytdən olduğu barədə Quranda hökm verildiyini və bunun böyük bir nemət olduğunu ifadə edir. Peyğəmbərin - salləllahu aleyhi va səlləm - 'xeyir' ifadəsi ilə məhz bu nemətə işarə etdiyi aydın olur."[64] Alimlərimizin verdikləri bu izahı dəstəkləyən dəlillər səhih rəvayətlərdə gəlir. İmam Əhməd deyir: "Məhəmməd ibn Musab bizə rəvayət etdi; Əvzai bizə rəvayət etdi; Şəddad Əbu Əmmar belə dedi: "Vasilə ibn Əsqanın yanına girdim və onun yanında bir qrup insan var idi. Onlar Əlidən danışdılar. Onlar qalxıb getdikdən sonra Vasilə mənə dedi: 'Sənə Rəsulullahdan - salləllahu aleyhi va səlləm - gördüyüm bir şeyi xəbər verməyimi istəmirsənmi?' Mən dedim: 'Bəli, söylə!' O dedi: 'Mən Fatimənin - radiyallahu anha - yanına getdim və ondan Əli haqqında soruşdum. O dedi: "O, Rəsulullahın - salləllahu aleyhi va səlləm - yanına getdi." Mən oturub onu gözlədim. Bir müddət sonra Rəsulullah - salləllahu aleyhi va səlləm - gəldi və onunla birlikdə Əli, Həsən və Hüseyn - radiyallahu anhum - da var idi. O, hər ikisinin əlindən tutmuşdu. Sonra evə girdi və Əlini və Fatiməni özünə yaxınlaşdırdı, onları qarşısında oturtdu. Həsən və Hüseyni isə hər birini bir budunun üzərinə qoydu. Sonra üzərlərinə bir örtük (və ya kisa) örtdü və bu ayəni oxudu: "Ey ev əhli! Allah sizdən günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir." Daha sonra dedi: "Allahım! Bunlar mənim Əhli-Beytimdir və mənim Əhli-Beytim buna daha layiqdir!"[65] Şeyx Şueyb hədis haqqında deyir: "Bu hədis səhihdir. Məhəmməd ibn Musab - və o, əl-Qurqusəni'dir - mütabiət (dəstəkləyici rəvayətlərdə) olduqda rəvayətləri həsəndir və burada mütabiət var. İsnadın digər raviləri Səhih əl-Buxari və Səhih Müslimdəki ravilərdir və etibarlı hesab olunurlar. Şəddad Əbu Ammara gəlincə, onun rəvayətlərini Müslim və əl-Buxari "Ədəbül-Müfrəd"də nəql etmişdir və o siqə ravilərdən sayılır." Gördüyümüz kimi bu hədisdən aydın şəkildə görünür ki, Peyğəmbər - aleyhissalətu vassələm - onların ayədəki kəramətə daha layiq olduğunu deməklə zövcələrinin artıq ayədəki kəramətlə murad olduqlarını təsdiqləmiş olur. Uzun sözün qısası budur ki, Təbriz müəllimin verdiyi nümunədə Peyğəmbərimiz Ummu Sələməyə "yox" cavabını vermir.

---

[64] əd-Dəvvani, "əl-Hucəc əl-Bəhira", səh: 219;
[65] "Musnəd Əhməd", 28/195 (16988)

## İdeoloji Təhrif Məsumluq

78-ci rəvayətdə Bureydə ilə Peyğəmbərimiz - salləllahu aleyhi va səlləm - arasında keçən söhbətdə Bureydə Əlinin qənimətdən özünə bir kəniz götürdüyünü, daha sonra ona nifrət etdiyini deyir və Peyğəmbərimiz onu bu sözünə görə qınayır, ona düzəliş edir və ona Əlini sevməyi əmr edir. Kitabın müəllifi buradan çox maraqlı, bir o qədər radikal olan bir nəticə çıxarıb: "**Lakin hədisdə diqqət çəkən önəmli nüans Peyğəmbərin Bureydənin şikayətinə necə qarşılıq verməsidir. Peyğəmbər özü həzrət Əlini Yəmənə qazi olaraq yollayarkən ona tövsiyə edir ki, əgər iki nəfər yanına şikayətə gələrsə, onda hər ikisini dinləməmiş hökm çıxarma. Bu, hökmün aydın olması və həqiqətin üzə çıxması üçün ən doğru yoldur. Gördüyünüz kimi, Peyğəmbər bir nəfərin şikayəti ilə hökm çıxarmağı doğru hesab etmir. Buna görə də Bureydənin şikayətindən sonra da həzrət Əlinin gəlməyini gözləməsi və onu dinlədikdən sonra mühakimə yürütməsi daha məqsədəuyğun idi. Lakin Peyğəmbər buna ehtiyac belə görmür və Bureydənin cavabını yerindəcə verir. Bu, əslində, Peyğəmbərin həzrət Əliyə olan etibarını göstərir. Hətta deyərdim ki, bu, etibarı da aşan bir məsələdir, çünki qəzavət etməyin müəyyən şərtləri var. Bir insan nə qədər etibarlı biri olsa da, əgər ondan şikayət olunubsa, onda qaydanın tələbinə əsasən, qazi hər iki şəxsi dinlədikdən sonra hökm çıxarmalıdır. Lakin Peyğəmbər həzrət Əli haqqında edilən şikayəti dinləyərkən bu qaydaya nəinki ehtiyac görmür, əksinə şikayət edən tərəfə haqsız olduğunu başa salmağa çalışır. Bu cür münasibət, fikrimcə, ancaq və ancaq məsim bir şəxs barəsində edilə bilər.**" Sitatın sonu. Sözün düzü bu cür arqumentlər mənə tamamilə başqa növ apologetikadan tanışdır; adətən xristianlar İsa Məsihin ilah olduğunu isbat etmək üçün bu cür dolaşıq və aydın olmayan arqumentlərə üz tuturlar. Kitabın müəllifi öz nöqteyi-nəzərini oxucuya məqbul göstərmək üçün səhnəni xeyli dramatikləşdirir; səhabə ilə Peyğəmbər arasında keçən söhbəti məhkəmə zalına çevirir, qazinin qarşısında olması gərəkən şahidlərin, məhkəmə prosedurunun olmadığını deyir. Bunun isə yalnız bir izahı ola bilərdi; həzrət Əli məsum idi. Görəsən aləmlərə rəhmət olaraq göndərilmiş və ərəblərin dil baxımından ən fəsahətlisi olan Peyğəmbərimiz üçün sadə şəkildə - "Əli məsumdur, ey

Bureydə! O, heç zaman xəta etməz, o nə edərsə bil ki, haqlıdır” demək bu qədərmi çətin idi?! Belə etmək nəinki Bureydə üçün problemi çözür, hətta digər müsəlmanlar üçün tamamilə yeni olan bir prinsip ortaya qoyur. Həqiqət budur ki, müəllifin burada oxuculara çatdırmaq istədiyi mənanın əslində məzmunda heç bir əsər əlaməti yoxdur. Çünki Bureydə ilə Peyğəmbərin arasındakı söhbət qazilik məqamını tələb edəcək bir məsələ deyildi. Bir qazinin digər tərəfin arqumentlərinə qulaq asmadan hökm verməsini qadağan edəcək səbəb burada mövcud deyildir, çünki Allahın elçisinin - salləllahu aleyhi va səlləm - qarşısına çıxarılmış ittihamın əslində İslam şəriətində ordu əmiri üçün mübah edilmiş işlərdən olduğu ortaya çıxdı. Yəni Allahın elçisi Bureydə'yə başa saldı ki, Əlinin qənimətdən götürdüyü şey onun haqqı idi və hətta ondan daha çoxuna layiq idi, ona görə də sənin ona qarşı gətirdiyim ittihamda onun kiminsə haqqına girdiyini görmürəm. Ona görə də Təbriz müəlliminin bu növbəti şərhlərinə ehtiyac qalmır: “**Gördüyünüz kimi, Peyğəmbər bir nəfərin şikayəti ilə hökm çıxarmağı doğru hesab etmir. Buna görə də Bureydənin şikayətindən sonra da həzrət Əlinin gəlməyini gözləməsi və onu dinlədikdən sonra mühakimə yürütməsi daha məqsədəuyğun idi.**” Qazinin şikayət edən tərəfin təbii haqqı olan bir məsələdə digər tərəfi dinləmədən şikayətçinin tələbini tətmin etməsi mümkündür, yəni digər tərəfi dinləmədən qərar verməyin qadağan olunması bütün hallara aid deyildir. Bunun misallarından biri Peyğəmbərin - aleyhissalətu vassələm - Hind bint Utbə'nin şikayətinə cavabıdır. Aişə anamız deyir: “Hind bint Utbə dedi: “Ey Allahın rasulu! Əbu Sufyan xəsis bir kişidir, mənə və övladıma kifayət edəcək qədər vermir, lakin onun xəbəri olmadan özüm ondan götürürəm.” (Peyğəmbər) dedi: “Sənə və övladına kifayət edəcək miqdarı məruf ölçüdə götür!”[66] Bu və digər dəlillərə görə sünnət əhlinin əksəriyyəti qazinin qayıb olan biri barəsində hökm verməsini icazəli görüblər. Sünnət əhli içində buna qarşı çıxanlar hənəfilərdir. Şiə məzhəbinə gəldikdə isə maraqlıdır ki, şiə fəqihləri bu nöqtədə sünnət əhlinin əksəriyyətinə müvafiqdirlər. əş-Şəhid əs-Səni yazır: “Əgər (əleyhində iddia qaldırılmış şəxs) şəhərdən kənarda olsa, istər uzaqda, istərsə də yaxın məsafədə olsun, bizim alimlərimizin ittifaqına görə onun barəsində hökm verilə bilər. Eynilə, əgər şəhərdə olsa, lakin hökm məclisinə gəlməsi qeyri-mümkün olsa – istər bu onun qəsdilə olsun, istərsə də hər hansı bir maneəyə görə – bu halda da hökm vermək caizdir. Əgər onun

[66] “Sahih əl-Buxari”, (2211, 5364, 5370, 7180) Sultaniyyə çapı. “Sahih Muslim”, (1714);

iştirak etməsi mümkünsə və heç bir maneə yoxdursa, bu halda da məşhur rəyə görə hökm vermək caizdir. Çünki bu barədə ümumi dəlillər mövcuddur."[67] Bir digər şiə fəqihi əl-Cəvahiri yazır: "(Əleyhində iddia qaldırılmış və məhkəmədə iştirak etməyən kəs) haqqında hökm verilməsinin ümumilikdə şəriətə uyğun olması baxımından bizim aramızda heç bir şübhə və ixtilaf yoxdur, hətta icma - hər iki qismi ilə - bunu dəstəkləyir. Bundan əlavə, daha əvvəl qeyd edilmiş Cəmil və Məhəmməd ibn Müslimin xəbərləri də bu hökmü dəstəkləyir. Hətta belə də deyilmişdir: bu barədə müstəfiz nəbəvi bir hədis də vardır; o hədisdə Hind – Əbu Sufyanın həyat yoldaşı – Peyğəmbər - salləllahu aleyhi və alih -ə şikayət edərək demişdi: 'Bu kişi xəsis adamdır, mənə və övladıma kifayət qədər xərclik vermir.' Peyğəmbər - salləllahu aleyhi və alih - isə buyurmuşdu: 'Sənə və övladına kifayət edəcək miqdarda, münasib şəkildə götür.' Halbuki Əbu Sufyan həmin vaxt orada yox idi… Belə olan halda, Əbul-Bəxtəri'nin "Qurbu'l-İsnad" kitabında Cəfərdən, o da atasından, o da Əlidən - aleyhissələm - nəql etdiyi rəvayət – 'Qeybətdə olan şəxs barəsində hökm verilə bilməz' – bu cür anlaşılmalıdır ki, burada məqsəd qeybətdə olan şəxsin üzərinə hökm o şəkildə verilməsin ki, sonradan o gəldikdə onun dəlil və bəhanəsinin eşidilməsi qəbul edilməsin. Yəni, bu hökm qəti və dəyişməz sayılmasın və ya başqa bir mənada başa düşülməlidir."[68]

Üstəlik yuxarıda qeyd etdiyimiz kimi burada şikayət edən tərəfin şikayətində nə qul haqqına, nə də Allahın haqqına qarşı zərrə qədər də xələl yox idi. Ona görə də Allahın elçisinin - aleyhissalətu vassələm - məhkəmə qurmasına və qarşı tərəfin cavabını eşitməsinə ehtiyac yox idi. Bütün bu təqdim etdiklərimizdən sonra deyə bilərik ki, kitabının müəllifinin isbat etməyə çalışdığı məsumluq üçün burada heç bir sübut və ya dəstəkləyici məna yoxdur.

[67] əl-Amili, "Məsəlikul-Əfhəm", 13/468;
[68] ən-Nəcəfi, "Cəvahirul-Kələm", 40/220;

## Əli özü Mövla sözünü necə anlayıb?

38-ci rəvayətdə deyir: “**Həzrəti Əli bu hədisdə başqa bir bölgədən qonaq gələn atlılar haqqında “mövla” sözünü işlədir. Kontekstdən aydın olur ki, burada həmin şəxslər barədə işlənən “mövla” sözündən məqsəd dostdur, çünki həmin şəxslər siravi insanlar idilər və rəhbərliklə bağlı heç bir iddiaları yox idi. Əksinə, bu dostluqlarını Qədirxum hədisi ilə əsaslandırırlar ki, bizim sənə olan dostluğumuz Peyğəmbərin Qədirxumdakı göstərişinə əsasəndir. Aydındır ki, buradakı dostluq da siravi bir dostluq deyil, çünki dostluq onsuz da Quranın əmridir. Həmin şəxslərin nəzərdə tutduqları dostluq itaətdən qaynaqlanan bir dostluqdur. Bunu eynən Allahla insan arasındakı dostluğa bənzətmək olar. İnsanın Allahla dostluğu Allahın rəbb, hakim olmasından qaynaqlanır və burada aydındır ki, məişət səviyyəsində dostluq deyil, itaət və tabeçiliyə əsaslanan dostluq nəzərdə tutulur. Atlıların nəzərdə tutduqları dostluq da bu qəbildən idi.**” Sitatın sonu. Bundan bir neçə rəvayət sonra, daha dəqiq desək 43-cü hədisdə də deyir: “**Riyah bin əl-Haris deyir: “Bir qrup insan Rəhbədə Əlinin yanına gəlib dedilər: “Salam, ey mövlamız!” Əli dedi: “Siz ərəb qövmüsünüz, mən sizin necə mövlanız oluram?” Dedilər: “Qədirxum günü Peyğəmbərin “Mən kimin mövlasıyamsa, bu da onun mövlasıdır” dediyini eşitmişik.” Riyad dedi: “Onlar gedəndən sonra kim olduqlarını soruşdum. Ənsar qəbiləsindən olduqları, Əbu Əyyub əl-Ənsarinin də aralarında olduğu deyildi.**” Sonra müəllif bu rəvayətlə bağlı bir qeyd açır və deyir: “**Bu hədis də Qədirxumda deyilən “mövla” sözündən məqsədin rəhbər və xəlifə olduğunu göstərir. Belə ki, həzrət Əlinin yanına gələn şəxslər ona “mövlamız” deyə müraciət edirlər. Həzrət Əli isə necə onların mövlası ola biləcəyini soruşur. Aydındır ki, burada işlənən “mövla” sözündən məqsəd “dost” deyil, əks təqdirdə, həzrət Əlinin “mən sizin necə mövlanız, yəni dostunuz ola bilərəm?” deməsi mənasız səslənər, çünki möminlərin bir-birinə dost və qardaş olduqları Quran və sünnə ilə təsbit edilib. Həmin şəxslərin həzrət Əliyə “mövlamız” deyə müraciət etmələrini Qədirxum hədisi ilə əsaslandırmaları da onu göstərir ki, həmin şəxslərin Qədirxum hədisindən başa düşdükləri məna həzrət Əlinin xəlifə və rəhbər təyin edilməsidir.**” Sitatın sonu. Bu hadisənin hər ikisinin kökü eynidir, yəni eyni hadisədir və hər ikisini rəvayət edən Riyah bin əl-Haris’dir. Hər ikisinin

isnadı səhihdir. İmam Əhməd "əl-Musnəd" kitabında deyir: "Yəhya bin Adəm bizə rəvayət etdi; Hənəş bin əl-Haris bin Ləqit ən-Nəxai əl-Əşcəi bizə Riyah bin əl-Haris'dən belə dediyini rəvayət etdi: "Bir qrup insan Rəhbədə Əlinin yanına gəlib dedilər: "Sənə salam olsun, ey mövlamız!" (Əli) dedi: "Siz ərəb bir qövm olduğunuz halda mən necə sizin mövlanız oluram?" Dedilər: "Allahın elçisini - salləllahu aleyhi va səlləm - Ğadir Xum günü belə deyərkən eşitdik: "Mən kimin mövlasıyamsa, bu da onun mövlasıdır." Riyah dedi: "Onlar getdikdən sonra arxalarına düşdüm və onların kim olduqlarını soruşdum: Dedilər ki, ənsardan bir qrupdur, aralarında Əbu Əyyub əl-Ənsari var." (Əhməd bin Hənbəl dedi) Əbu Əhməd bizə rəvayət etdi; Hənəş bizə Riyah bin əl-Haris'dən belə dediyini rəvayət etdi; "Ənsardan bir qrup gördüm, Rəhbədə Əlinin yanına gəlmişdilər. (Əli) soruşdu ki, onlar kimdir? Dedilər: "Sənin mövlalarınıq, ey möminlərin əmiri!" (Riyad hədisin arxasında) eyni mənanı zikr etdi."[69] İmam İbn Dizil əl-Həməzəni əl-Kisəi (ö. h. 281) "Siffin" kitabında deyir: "Yəhya bin Süleyman Cufi bizə rəvayət etdi; dedi: İbn Fudeyl bizə rəvayət etdi; dedi: əl-Həsən bin əl-Həkəm ən-Nəxai bizə Riyah bin əl-Haris ən-Nəxai'dən belə dediyini rəvayət etdi: "Mən Əli - aleyhissələm - ilə birlikdə oturmuşdum ki, bir dəstə insan üzlərini örtmüş halda onun yanına gəldi. Dedilər: "Salam olsun sənə, ey bizim mövlamız!" Əli onlara dedi: "Məgər siz ərəblərdən deyilsinizmi?" Dedilər: "Bəli, lakin biz Allah Rəsulunun - salləllahu aleyhi və alih va səlləm - Qədir Xum günü belə buyurduğunu eşitmişik: 'Mən kimin mövlasıyamsa, bu Əli də onun mövlasıdır. İlahi! Onu sevəni sev, ona düşmən olana düşmən ol; ona yardım edəni yardım et, onu köməksiz buraxanı köməksiz burax!'" (Bunu eşitdikdə) mən Əlinin güldüyünü gördüm – elə ki, azı dişləri göründü – sonra buyurdu: "Şahid olun!" Sonra həmin adamlar öz çadırlarına doğru yollandılar. Mən də onların ardınca getdim və onlardan birinə dedim: "Bu adamlar kimdir?" Dedi: "Biz Ənsardan bir dəstəyik. Bu isə – dedikdə onlardan birini işarə etdi – Peyğəmbərə - salləllahu aleyhi və səlləm - ev sahibi olmuş Əbu Əyyubdur." Mən ona yaxınlaşıb əlini sıxdım."[70] əz-Zəhəbi'nin zikr etdiyi 38-ci hədis isə belədir: "Ubeydullah bin Musa rəvayət etdi; Yusuf bin Suheyb bizə Həbib bin Yəsar'dan, o da Əbu Ramlə'dən xəbər verdi ki, "Bir neçə atlı Əlinin yanına gəldilər və dedilər: "əs-Sələmu aleykə va rahmətullahi va bərakətuh!" Əli dedi: "Va aleykum! Atlılar hardan gəlirlər?" Dedilər: "Sizin mövlalarınız fılan

[69] "Musnəd Əhməd", 38/541-542
[70] İbn Əbil-Hədid, "Şərh Nəhcil-Bələğa", 3/208

və fılan torpaqlardan gəlirlər.” Dedi: “Siz hardan mənim mövlalarım oldunuz?” Dedilər: “Allahın rasulunu - salləllahu aleyhi va səlləm - Qədir Xum günü belə deyərkən eşitdik: “Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır.” Allahım, ona dost olana dost, düşmən olana düşmən ol!” Əli dedi: “And verirəm Allaha, kim Peyğəmbərin dediyi həmin sözü eşidibsə, ayağa qalxsın!” On iki nəfər ayağa qalxıb buna şahidlik etdilər.”[71] əl-Busiri deyir: “Hənəş bin əl-Haris'dən, o da Riyah bin əl-Haris'dən; dedi: “Rəhbədə Əli bin Əbi Talibin yanına gəlmiş bir qövm gördüm. (Əli) soruşdu: “Bu qövm kimdir?” Dedilər: “Sənin mövlalarınıq, ey möminlərin əmiri!” (Əli) dedi: “Siz ərəblərdən bir qövm olduğunuz halda hardan (mövlanız oluram)?” Dedilər: “Allahın elçisini - salləllahu aleyhi va səlləm - Qədir Xum günü belə deyərkən eşitdik: “Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır.” (Riyad) dedi: “Onların arxasınca düşdüm və soruşdum: “Bu qövm kimdir?” Dedilər: “Ənsardan bir qövmdür.” (Riyad) dedi: “Bir də gördüm ki, aralarında Əbu Əyyub əl-Ənsari də var.” (əl-Busiri) deyir: Bunu Əbi Bəkr bin Əbi Şeybə, Əhməd bin Hənbəl və Əhməd bin Məni rəvayət edib, bu ləfz ona (yəni İbn Məni'yə) aiddir. Raviləri siqadır.”[72] Bütün bu rəvayətlər səhih isnadlarla bu hadisənin necə baş verdiyini bizə izah edir və yuxarıda qeyd etdiyimiz kimi söhbət eyni hadisədən, eyni qarşılaşmadan gedir; ənsardan bir qrup ilə möminlərin əmiri Əli - radiyallahu anhum əcməin - arasında baş verən bir söhbəti Riyah bin əl-Haris bizə nəql edir. Bir rəvayətdə sadəcə olaraq keçir ki, Əli onlardan kim olduqlarını soruşduqda “sənin mövlalarınıq, ey möminlərin əmiri!” deyiblər. Daha səhih olan versiyada onlar Əliyə “sənə salam olsun, ey mövlamız” deyiblər və beləcə də həzrət Əli onların onu mövla adlandırmaqlarına təəccüb edərək “siz məgər ərəb deyilsizmi?!” soruşub. Belə bir təəccübün izahını vermədən əvvəl gəlin kitabın müəllifinin verdiyi izaha baxaq.

Görürük ki, kitabın müəllifi eyni hadisənin fərqli rəvayət şəkillərinə fərqli izahlar verib. Birinci rəvayəti, yəni “biz sənin mövlalarınıq, ey möminlərin əmiri!” sözünü izah edərkən yazır: “**Kontekstdən aydın olur ki, burada həmin şəxslər barədə işlənən “mövla” sözündən məqsəd dostdur, çünki həmin şəxslər siravi insanlar idilər və rəhbərliklə bağlı heç bir iddiaları yox idi.** ” Aydındır ki, Təbriz müəllim bu rəvayətdə keçən “mövla” sözünü rəhbər, başçı, əmir mənasında izah edə bilmir, çünki əks təqdirdə ənsarın

[71] “Turuq Hədis Mən Kuntu Məvləhu”, səh: 44-45;
[72] əl-Busiri, “İthəful-Xiratil-Məhəra”, 7/212;

Əliyə dedikləri sözün mənası "sənin başçılarınıq" və ya "sənin əmirinik" olardı, bu isə batildir. Ona görə də müəllif məcbur olaraq buradakı "mövla" sözünü izah edərkən sünnilərin Qədirxum hədisi üçün verdikləri izahla razılaşmalı olur. Lakin qəribə bir üslub işlədərək deyir: "**Həmin şəxslərin nəzərdə tutduqları dostluq itaətdən qaynaqlanan bir dostluqdur. Bunu eynən Allahla insan arasındakı dostluğa bənzətmək olar. İnsanın Allahla dostluğu Allahın rəbb, hakim olmasından qaynaqlanır və burada aydındır ki, məişət səviyyəsində dostluq deyil, itaət və tabeçiliyə əsaslanan dostluq nəzərdə tutulur. Atlıların nəzərdə tutduqları dostluq da bu qəbildən idi.**" Mövla sözünün rəhbər, başçı mənasını verə bilməyəcəyini dərk etsə də dolayı yollarla bu sözü yenə də rəhbər və başçı mənalarına calamağa çalışır. 43-cü rəvayət üçün yazdığı izah da mənasızdır, əksinə açıq-aşkar bir təhrifdir. Təbriz müəllim heç rəvayətdə Əlinin - kərraməllahu vachəhu - ənsara verdiyi suala aydınlıq gətirməyə çalışmır; oxucusu üçün izah etmir ki, həzrət Əli nə üçün ənsarın sözlərinə o cür təəccüblə cavab verərək soruşur: "Soz ərəb bir qövm olduğunuz halda mən sizə necə mövla ola bilərəm?!" Burada iki hal mövcuddur, ya Təbriz bəy həqiqətən də rəvayətdəki qəsdi anlamayıb, ya da anlayıb amma təhrifə üstünlük verib. Halbuki rəvayətin mənası çox aşkardır. Çünki burda mövlalıq əcəmlik ilə əlaqələndirilir, yəni ərəblərdən mövla olmaz deyilir. Bunun səbəbi isə budur ki, o dövrdə İslama daxil olmuş qeyri-ərəb qövmlər "mövlalar" olaraq tanınırdılar; çünki mövlalıq ya köləlik ilə, ya müttəfiqlik ilə, ya da İslama daxil olmaqla qazanılırdı. Misal üçün Məkkənin böyük alimlərindən Abdulməlik ibn Cureyc azad edilmiş bir kölə idi, babası Cureyc (George) bizanslı kölələrdən idi və əməvi qəbiləsindən bir qadın köləsi olub. Cureyc azad olunduqdan sonra əməvilərin mövlası olub, ona görə də İbn Cureyc üçün bu barədə əməvilərin mövlası deyirlər. Bu baxımdan "mövlalar" çoxluq təşkil edir. Burada İslamı qəbul etmək baxımından da mövla olmaq halı yayğındır. əl-İraqi "Əlfiyyə" mənzuməsində bunu üç səbəblə bağlayır; 1) atəqa, 2) hilf və 3) din mövlalığı; birincisinin çoxluq təşkil etdiyini deyir, ikincisinə İmam Malik'in "ət-Teymi" nisbətini misal verir, üçüncü növ üçün isə İmam əl-Buxari'nin "əl-Cufi" adlanmasını misal göstərir.[73] əs-Səxavi bu sözləri izah edərkən deyir: "Alimlər və ravilər arasında mövlalar məsələsi mühüm mövzulardandır. Xüsusilə də "atəqa (köləlikdən azad olunma) mövlası qəbiləyə nisbət olunur"... Tabiindən Əbul-Aliyə Rafi ər-Riyəhi ət-Təmimi

[73] "Əlfiyyətul-İraqi", səh: 362;

buna misaldır; o, Bənu Riyah qəbiləsindən bir qadının azadlı köləsidir. Həmçinin Məkhul əş-Şəmi əl-Huzəli - əz-Zuhri'nin dediyinə görə - nubiyalı bir kölə idi, onu Huzeyl qəbiləsindən bir qadın azad edib. Bura həm də Əbul-Bəxtəri Said bin Feyruz ət-Tai, Abdullah bin əl-Mubərak əl-Hanzali və əl-Leys'in katibi Abdullah bin Saleh əl-Cuhəni'ni və başqalarını nisbət etmək olar. Onlardan hər birində qəbiləyə heç bir qeyd qoyulmadan nisbət olunduqları üçün onların sülbdən doğularaq qəbiləyə nisbət olunduqları güman edilə bilər. Azad edilmə yolu ilə qəbiləyə nisbət edilmə halları əsasa və həqiqi mənşəyə nisbətə azlıq təşkil etsə də, sonrakı hallar baxımından daha çox yayılmışdır. Əsldən və zahirdən kənar olanlar ya azad olunma yolu ilə, ya da "hilf vilayəti" yolu ilə mövla olurlar ki, hilfin kökü qarşılıqlı ittifaq, dəstək və yardımlaşma üzərində qurulmuş müqavilədir. İslam isə cahiliyyə dövründə tayfalar arasında düşmənçilik və hücum məqsədilə edilən bu cür ittifaqları ləğv etmişdir. İslam, yalnız məzluma kömək və qohumluq əlaqələrinin qorunulması kimi müsbət məqsədləri təsdiqləyib. Bu kateriqoriyaya aid olanlar bir qrup (alimlər və ravilər)dir. Məsələn "ət-Teymi" nisbəti hicrət evinin imamı Malik bin Ənəs üçün deyilib; o, kök etibarı ilə himyərli və əsbəhi sayılır, lakin onun Əsbəh aşirəti Osman bin Ubeydilləh bin Osman bin Amr bin Kəb bin Said bin Teym bin Murra əl-Quraşi ət-Teymi'nin, yəni Talha'nın qardaşının müttəfiqləri olduqları üçün ona "teymi" nisbəti verilib. Ya da icarə işbirliyi və ya dərs yoldaşlığı və buna bənzər səbəblərdə olduğu kimi "yoldaşlıq mövlalığna" görə deyilə bilər. Buna yenə Malik misaldır, çünki deyilmişdir ki, onun bu şəkildə Teymi nisbəti almasının səbəbi budur ki, babası Malik ibn Əbi Amir, Təlhə ibn Ubeydullahın ticarətlə məşğul olduğu vaxtlarda onun yanında işləyən muzdlu işçi olmuşdur. Ya da Miqsəm misal verilə bilər, ona İbn Abbasın - radiyallahu anhumə - mövlası deyilib, çünki onun yanından ayrılmazdı...Yaxud da din və İslama görə mövlalıq ola bilir; buna da misal olaraq 'əl-Cuʿfī' (جُعْفِي) nisbətini göstərmək olar. Bu sənətin imamı, Əbu Abdilləh Muhəmməd bin İsmayıl bin İbrahim bin əl-Muğirə əl-Buxariyə verilmiş nisbətdir. Bu nisbət ona ona görə verilmişdir ki, onun babası əl-Muğirə əvvəlcə məcus (atəşpərəst) idi, sonra isə əl-Yəmən bin Əxnəs əl-Cuʿfinin əli ilə müsəlman olmuşdur. Bu şəxs isə əl-Buxari'nin şeyxlərindən biri olmuş Abdullah bin Muhəmməd ibn Cəfər ibn

Yəmən əl-Musnədi əl-Cufi'nin babasının atası idi. Eyni şəkildə, Əbu Əli əl-Həsən bin İsa bin Məsərcis əl-Məsərcisi də buna misaldır; bu şəxs əvvəlcə xristian idi və sonra İbn Mubarəkin əli ilə İslamı qəbul etmişdi. Ona da 'İbn Mübarəkin mövlası' deyilirdi."[74] Beləliklə də artıq xəlifələrin dönəmində mövlalar qeyri-ərəb olmaqları ilə seçilirdilər. Ya keçmiş kölələrin və ya kölələrin övladları idilər, ya da İmam əl-Buxari'nin misalında olduğu kimi İslamı qəbul etmiş əcəmi müsəlmanlar idilər. Ərəb qəbilələrin arasındakı döyüşdə ittifaq, himayə mənasındakı mövlalıq isə - əs-Səxavi'nin dediyi kimi - İslamın gəlişi ilə ləğv olundu, tədricən yox oldu. Həzrəti Əlinin zamanında qeyri-ərəblərin hamısına mövla deyilməsə də, mövla deyilənlər əsasən qeyri-ərəblər idi. Amma artıq əməvilərin dönəmindən başlayaraq ərəb olmayan bütün digər xalqlara mövla adı verilməyə başlandı. Ona görə də əl-Fəsəvi tarixində qeyd edir ki, Mə'mər bin Raşid deyir: "əz-Zuhrini eşitdim; ona dedilər: "Deyirlər ki, sən mövlalardan hədis rəvayət etmirsən." Dedi: "Mücahirlərin və ənsarın övladlarını gördüyüm halda mövlaları nə edirəm?"[75] Bütün bunları bildikdən sonra həzrət Əlinin nə üçün ənsardan olan ərəblərin ona "mövla" deməklərini təəccüblə qarşılamağını başa düşmək asanlaşır, ona görə də soruşur ki, "ərəb olduğunuz halda necə sizin mövlanız oluram?!"

Təbriz müəllimin kitabı boyunca israrla isbat etməyə çalışdığı mənanı bu rəvayət tamamilə inkar edir və onun əsassız olduğunu göstərir. Çünki "mövla" sözündən ilk ağla gələn məna əmir, dövlət başçısı olsaydı o zaman möminlərin əmirinə "mövla" deyildikdə bunu təəccüblə qarşılamazdılar. Belə görünür ki, hamıdan qabaq elə həzrət Əli özü "mövla" sözündən Təbriz müəllimin və onun həmfikirlərinin başa düşdüyü mənanı başa düşməyib. Əgər mövla sözündə "rəhbərlik", "başçılıq", "əmirlik" mənaları bu qədər aşkar idisə Əlinin möminlərin əmiri olduğu halda ona "mövla" deyilməsinə bu cür qarşılıq verməsi tamamilə mənasızdır. Bunun yeganə izahı odur ki, "mövla" sözü bu mənası ilə insanların istifadəsində yox idi. Elə ona görə də Allahın elçisinin - salləllahu aleyhi va əlihi va səlləm - Qədirxumda dediyi mövla sözünü səhabələrdən heç kim o mənada başa düşməmişdi. Əgər desələr ki, Əli o mənanı başa düşürdü o zaman izah etmək lazımdır ki, bunun ərəb və ya qeyri-ərəb olmaqla nə əlaqəsi var?! Bu aşkar həqiqəti qəbul etmək

---

[74] əs-Səxavi, "Fəthul-Muğis bi Şərhi Əlfiyyətil-Hədis", 4/393-395;

[75] əl-Fəsəvi, "əl-Mərifə vat-Tərix", 1/641;

kiməsə çətin gəlirsə bunun yeganə səbəbi təəssübkeşlikdir. Müəllifin müzakirəsinin axırında dediyi sözləri bir daha oxuyaq: "**Həmin şəxslərin həzrət Əliyə "mövlamız" deyə müraciət etmələrini Qədirxum hədisi ilə əsaslandırmaları da onu göstərir ki, həmin şəxslərin Qədirxum hədisindən başa düşdükləri məna həzrət Əlinin xəlifə və rəhbər təyin edilməsidir.**" Əksinə, həmin şəxslərin həzrət Əliyə "mövlamız" deyə müraciət etmələrini Qədirxum hədisi ilə əsaslandırmaqları onu göstərir ki, onlar o hədisdən o mənanı başa düşmürdülər, çünki əgər "mövla" sözü ilə rəhbər, başçı mənasını qəsd etsəydilər həzrət Əli onlara "necə mövlanız oluram?" dediklərində bunun ən sadə cavabı belə olardı: "Məgər sən möminlərin əmiri deyilsənmi?!" Təsəvvür edin ki, ənsar Əliyə "ey başçımız" deyir və Əli onların belə deməklərinin səbəbini soruşduqda onlar Əlinin faktiki və hüquqi olaraq möminlərin əmiri və xəlifələri olduğunu xatırlatmaq əvəzinə hədis nəql edirlər. "**Aydındır ki, burada işlənən "mövla" sözündən məqsəd "dost" deyil, əks təqdirdə, həzrət Əlinin "mən sizin necə mövlanız, yəni dostunuz ola bilərəm?" deməsi mənasız səslənər, çünki möminlərin bir-birinə dost və qardaş olduqları Quran və sünnə ilə təsbit edilib**" sözlərinə gəldikdə isə bu da çox mənasız bir etirazdır, çünki Allah Quranda "mömin kişilər və mömin qadınlar da bir-birlərinin dostudurlar" [9:71] deməyinə baxmayaraq möminlərin bir-birilərinə dost mənasında "ey mövlamız", "ey vəlimiz" deməkləri adət edilməmişdi. Üstəlik bu etirazı yersiz edən ən əsas səbəb budur ki, həzrət Əlinin "mən necə sizin mövlanız ola bilərəm?" sualı yuxarıda izah etdiyim kimi ərəb və qeyri-ərəb ayırımı ilə bağlıdır. Çox təəssüf ki, Təbriz müəllimə sərf etmədiyi üçün hədisdəki o hissə haqqında heç bir şərh verməyib.

## Qurandan ən son nazil edilən

Müəllif 87-ci hədisin tərkibində əz-Zəhəbi'nin rəvayət yollarından birini belə çatdırır: "**Şəhr ibn Huşəb Əbu Hüreyrədən belə rəvayət edir: "Peyğəmbər Əlinin əlindən tutub "Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır" dedikdən sonra "Bu dün dininizi sizin üçün kamil etdim" ayəsi nazil oldu". Əbu Hüreyrə deyir: "O, Qədirxum günüdür. Kim zilhiccə ayının on səkkizi oruc tutsa, altmış günün orucunun savabını əldə edər." Zəhəbi yazır: "Bu**

**hədis inkar olunan, qeyri-səhih hədisdir. Bu ayənin Ərəfə günü Ərəfədə nazil olduğu isbat olunub. Bu günün orucunun xüsusi olaraq heç bir fəziləti yoxdur. Rafizilər bu günü bayram olaraq qəbul edir və şənlik edirlər. Bu hədisin hansı mənaya yozulmalı olduğunu bilmirəm. Umeyra ibn Sədin rəvayət etdiyi hədisdə Əlinin insanlara and verən zaman Əbu Hüreyranın ayağa qalxan şəxslərlə ayağa qalxıb şahidlik etdiyi qeyd olundu.**" əz-Zəhəbinin sözlərini nəql etdikdən sonra kitabın müəllifi öz qeydini əlavə edir və deyir: "**Zəhəbi iddia edir ki, "Maidə" surəsinin 3-cü ayəsində keçən "Bu gün dininizi kamil etdim..." ayəsi Ərəfədə nazil olub və yuxarıdakı hədisin məzmunu həqiqəti əks etdirmir. Lakin həmin hədis şiə hədis qaynaqlarında keçən Qədirxum günü ilə bağlı hədislərlə üst-üstə düşmür. Peyğəmbər Vida həccindən qayıdarkən yolda "Qədirxum" adlanan yerdə ona əvvəlcə bu ayə nazil olur: "Ey Peyğəmbər! Sənə nazil olanı çatdır. Əgər bunu etməsən, onda Onun risalətini çatdırmamısan." Bu ayə nazil olandan sonra hədislərdə qeyd olunduğu kimi, Peyğəmbər həzrət Əlini çağırır və onun özündən sonra bütün müsəlmanların rəhbəri olduğunu insanlara çatdırır. Bundan sonra "Maidə" surəsinin 3-cü ayəsi – "Bu gün dininizi sizin üçün kamil etdim və sizə olan nemətimi tamamladım" ayəsi nazil olur.**" Sitatın sonu. Burada ilk öncə Təbriz müəllimin yol verdiyi kiçik xətalar nəzərimizə çarpır. Bu xəbəri Əbu Hureyra'dan rəvayət edən ravinin atasının adı Həvşəb (hə hərfi fəthəli) olmalıdır. Rəvayətin mətnindəki xəta isə budur ki, orada "altmış gün" yox, lakin "altmış ay" keçir. Sözün düzü kitabın müəllifinin bu rəvayətdəki Qədirxum orucunun fəziləti haqqındakı fantastik iddianı nə üçün bu qədər yüngülləşdirdiyini bilmirəm və spekulyasiya etmək də istəmirəm. Amma rəvayətin mətnində "altmış gün" yox, "altmış ay" keçir. Üstəlik əz-Zəhəbinin sözlərinin dəqiq tərcüməsi belə olmalıdır: "Bu günün orucunun xüsusi olaraq heç bir fəziləti yoxdur; axı necə ola bilər, halbuki rafizilər o günü bayram qəbul edir və o günü şənlik edirlər."[76] Yəni əz-Zəhəbi demək istəyir ki, burada uyğunsuzluq var; bayram və şənlik günündə oruc tutulmaz, çünki bayram günləri oruc tutmaq qadağan olunub. Müəllifin əz-Zəhəbinin mətnindəki bu incə tənqidi oxucusuna çatdırması lazımdır, lakin təəssüf ki, müəllif kitabında bu cür nüansları nəzərindən qaçırıb. Şiələrdə bu gün tutulan orucun savabı haqqında fərqli xəbərlər gəlib; bəzi xəbərlərdə bu günün orucu gördüyümüz kimi altmış ayın orucuna bərabər tutulur, bəzi

[76] "Turuq Hədis Mən Kuntu Məvləhu", səh: 82;

xəbərlərdə bu ayların sayı səksəndir[77], başqa bir rəvayətdə o gün edilən əməlin "altmış ilin əməlindən daha fəzilətli" olduğu qeyd olunur.[78] Daha bir rəvayətdə isə ümumiyyətlə "dünyanın ömrü qədər əməl edənin" savabı yazılır.[79] Şiə alimi Yusuf əl-Bəhrani - şiələrdə formalaşmış bir adət olaraq - bu günün orucu haqqında gəlmiş xəbərlərə də mütəvatir hökmü verir.[80] Şiələr hətta bu gün üçün xüsusi bir namaz da təsis ediblər və onu müstəhəb namazlar sırasında qeyd edirlər. Zəval vaxtından - yəni zöhr girmədən - yarım saat əvvəl iki rükət namaz qılırlar; hər rükətdə fatihədən sonra on bir dəfə ixlas surəsini, on dəfə ayətul-kursini və qədr surəsini oxuyurlar. Şeyx Saduq yazır ki, "Ğadir Xum gününün namazına və o gün oruc tutana düşən savaba gəldikdə isə şeyximiz Muhəmməd ibn əl-Həsən - radiyallahu anhu - bunu səhih saymazdı…və həmin şeyxin səhih saymadığı hər bir şey, səhih saymadığı hər bir xəbər bizə görə də səhih deyildir, tərk edilmişdir."[81] Buna baxmayaraq əs-Saduq'dan sonra gələn şiə alimləri bu namazı müstəhəb namaz olaraq qəbul ediblər. Şiələrdə "muhaqqiq" ləqəbi ilə tanınan Nəcmuddin əl-Hilli "əl-Mutəbər" adlı kitabında rəvayətin isnadındakı ravinin "aşırılıq" ilə tənqid olunduğunu qeyd etsə də yenə də o rəvayətlə əməl edir və namazı müstəhəb namazlar arasında qeyd edir.[82] Ayənin nə zaman nazil olmasına gəldikdə isə əlimizdəki səhih xəbərlər təkidlə təsdiq edirlər ki, "ikməl" ayəsi Arafə günündə nazil olub. İbn Abbas deyir: "Bu ayə Arafa günündə, cümə günü nazil oldu."[83] Bir başqa rəvayətdə yəhudilərdən biri Ömərin yanına gəlir və deyir: "Ey möminlərin əmiri, siz kitabınızda elə bir ayə oxuyursuz ki, o əgər biz yəhudilərə nazil olsaydı o günü bayram edərdik." Dedi: "O hansı ayədir?" Dedi: "Bu gün sizin üçün dininizi kamil etdim və sizə olan nemətimi tamamladım…" Ömər bunun üzərinə dedi: "Allaha and olsun ki, mən bu ayənin Allahın elçisinə - salləllahu aleyhi va sălləm - nazil olduğu günü və nazil olduğu vaxtı bilirəm; cümə günündə Arafa gecəsi."[84] Həmçinin Muhəmməd ibn əl-Hənəfiyyə vasitəsilə rəvayət olunur ki, Əli bin Əbi Talib deyib: "Allahın elçisinə - salləllahu aleyhi va

[77] "Savabul-Aməl", səh: 99;
[78] "əl-Xisal", 1/264 (rəq: 145); əs-Saduq, "Mən Lə Yəhduru əl-Fəqih", 2/90 (rəq: 1817)
[79] ət-Tusi, "Təhzibul-Əhkəm", 3/143;
[80] əl-Bəhrani, "əl-Hədəiq ən-Nədira fi Əhkəm əl-İtratit-Tahira", 13/362;
[81] əs-Saduq, "Mən Lə Yəhduruhu əl-Fəqih", 2/90-91;
[82] əl-Muhəqqiq, "əl-Mutəbər fi Şərh əl-Muxtəsar", 2/373; Həmçinin bax: əş-Şəhid əl-Əvvəl, "Zikra əş-Şia fi Əhkəm əş-Şəria", 4/281-282; əl-Bəhrani, "əl-Hədəiq ən-Nadira", 10/535-536;
[83] "Musnəd Əbi Davud ət-Tayəlisi", 4/428 (2832); ət-Tirmizi (3044) və isnadı səhihdir.
[84] "Musnəd Əhməd", 1/320 (188); Şeyx Şueyb isnadının əl-Buxari və Muslim şərtlərinə görə səhih olduğunu yazır. "Sahih əl-Buxari", 45, 4145, 4330, 6840; Muslim, 3017

səlləm - Arafədə ikən axşam vaxtı nazil oldu."[85] əs-Suddi deyir: "Bu ayə Arafa günü nazil olub."[86] əş-Şabi deyir: "Bu ayə Allahın elçisi - salləllahu aleyhi va səlləm - Arafadə ikən nazil oldu."[87] Sufyan əs-Səvri deyir: "Arafa günündə, bir cümə günü nazil olub."[88] Ona görə də Əbul-Həsən Əli bin Əhməd əl-Vahidi (ö. h. 468) yazır: "Ayədəki gün ilə qəsd olunanın Arafə günü olmasında və bu ayənin bir cümə günü nazil olmasında icma ediblər..."[89] Şiə kitablarına gəldikdə isə əl-Kuleyni "əl-Kafi" kitabında isnadı ilə Muhəmməd əl-Baqir'in belə dediyini rəvayət edir: "Sonra vilayət əmri nazil oldu və bu, peyğəmbərə cümə günü Arafada gəldi və Allah nazil etdi: "Bu gün sizin üçün dininizi kamil etdim və sizə olan nemətimi tamamladım..."[90] Şiə təfsir alimlərindən ət-Tabətabəi "əl-Mizən" təfsirində əhlüs-sünnət ilə razılaşır və deyir: "Burada «gün» ilə məqsəd, Vida Həccində Ərəfə günü nəzərdə tutulur. Bu, elə bir gündür ki, İslamın cahiliyyə dövrünün qalıqlarından olan alçaldıcı adətləri, murdarlıqları və xurafatlarını batil etməklə bağlı qalan hökmləri izah edən bu ayə həmin gün nazil olmuşdur. Bu ayə, həmçinin müsəlmanların müşriklərə qarşı tam və daimi bir üstünlüyə nail olduqlarını, bundan sonra artıq müşriklərin bu vəziyyəti dəyişdirmək ümidi qalmadığını və onlara qarşı hər hansı bir güzəştə getməyə və ya onların aqibətindən qorxmağa ehtiyac olmadığını müjdələyirdi."[91]

Eyni hədisə əlavə etdiyi qeydin davamında, 139-cu səhifədə yazır: "**Kontekstlə bağlı qeyd olunanlar doğrudur. Mətni düzgün anlamaq üçün kontekst şərtdir. Lakin mətni düzgün izah etmək üçün bəzən əlavə nüasnlara fikir vermək lazımdır. Məsələn, gəlin "Maidə" surəsinin 67-ci ayəsinə diqqətlə bir də nəzər salaq. Burada fikir verilməsi lazım olan bir neçə məsələ var. Müsəlman tədqiqatçılar "Maidə" surəsinin Peyğəmbərə nazil olan ən son surə olduğu barədə həmfikirdirlər. Cübeyr ibn Nüfeyrin rəvayət etdiyinə görə, bir gün möminlərin anası Aişə bint Əbu Bəkrin yanında olanda Aişə ona belə bir sual verir: "Maidə" surəsini oxuyursanmı?" Cübeyr dedi: "Bəli." Aişə dedi: "O, nazil olan son surədir. Orada halal gördüyünüz hökmləri halal, haram gördüklərinizi də haram**

[85] ət-Tahavi, "Şərh Muşkil əl-Əsər", 6/308 (2501);
[86] "Təfsir ət-Tabəri", 9/518;
[87] "Sunən Said bin Mənsur", 4/1438 (713) İsnadı səhihdir. "Təfsir ət-Tabəri", 2/34;
[88] "Təfsir Sufyan əs-Səvri", səh: 99;
[89] əl-Vahidi, "ət-Təfsir əl-Bəsit", 7/253
[90] əl-Kuleyni, "əl-Kafi", 1/290
[91] ət-Tabətabəi, "Təfsir əl-Mizən", 5/172;

**bilin." Bu hədis "Maidə" surəsinin Peyğəmbərə nazil olan son surə olduğunu deyir, deməli, o, Mədinə şəhərində, Peyğəmbərin ömrünün sonlarına yaxın nazil olub. Tarixdən də aydın olduğu kimi, Peyğəmbər Mədinə şəhərində hökumət qurmuş və iqtidara çatmışdı. Kitab əhli orada müsəlmanlar üçün ciddi təhlükə mənbəyi hesab olunmurdular**." Sitatın sonu. Müəllifin burada oxucusuna çatdırmaq istədiyi arqument budur ki, Məidə surəsinin 67-ci ayəsi Peyğəmbərin - salləllahu aleyhi va səlləm - həyatının sonunda nazil olmalıdır. "Ey Peyğəmbər! Rəbbindən sənə nazil ediləni təbliğ et! Əgər bunu etməzsən, Onun risalətini təbliğ etməmiş olarsan. Allah səni insanlardan qoruyacaqdır. Şübhəsiz ki, Allah kafir qövmü doğru yola yönəltməz."[5:67] Belə olduğu təqdirdə - Təbriz müəllimə görə - İbn Həvşəb'in Əbu Hureyra'dan rəvayət etdiyi xəbər tarixin zaman çizgisi ilə uyğun gəlir. Hər şeydən əvvəl qeyd etməyimiz lazımdır ki, Maidə surəsinin Qurandan endirilmiş ən son surə olması məsələsində müsəlman tədqiqatçılar həmfikir deyillər. Bunu hardan oxuduğunu bilmirəm, lakin Quran elmləri ilə bağlı kitab əlinə adam gözəl bilir ki, bu məsələ müsəlman tədqiqatçılar arasında ixtilaflı məsələdir və bunun səbəbi bu barədə Peyğəmbərdən mərfu heç bir xəbərin varid olmamasıdır. Səhabələr də bu nöqtədə ixtilaf ediblər və müəllifin burada təqdim etdiyi rəy Aişə anamızın rəyidir. Lakin digər rəylər də varid olub; əl-Bəra bin Azib - misal üçün - ən son nazil olanın Nisa surəsindəki ayə olduğunu deyir. Ömər, İbn Ömər və İbn Abbas isə ən axırıncı endirilənin Bəqərə surəsindəki ayə, daha dəqiq desək "Allaha qayıtdığınız o gündən çəkinin! Sonra hər kəsə, qazandığının əvəzi tam olaraq veriləcək və onlara heç bir haqsızlıq edilməyəcəkdir" [2:281] ayəsi olduğunu deyiblər. Abdullah bin Amr və digər rəvayətdə Abdullah ibn Abbas deyib ki, ən sonuncu enən surə ən-Nəsr surəsi olub.[92] Bütün bu məlumatlar işığında müəllifin belə bir məsələdə yekdil rəy iddiası əsassızdır. Lakin istənilən halda müəllif haqlıdır ki, Maidə surəsi ən son nazil olduğu deyilən surələrdən biridir. Sanki buradan çıxış edərək müəllif demək istəyir ki, Maidə surəsinin 67-ci ayəsi də eyni məntiqlə Peyğəmbərin həyatının son aylarından birində nazil olmalıdır. Sanki müəllifə görə əgər bir surə ən son enən surədirsə onun içindəki bütün ayələr də ən son enən ayələr olmalıdır, yəni əgər Maidə surəsi ən son enən surədirsə Maidə 67-də ən son enən ayələrdən biri olmalıdır. Əks təqdirdə müəllifin bunu arqument olaraq

[92] Bütün bu rəylər üçün bax: əz-Zərkəşi, "əl-Burhan fi Ulum əl-Quran", 1/209-210; əs-Suyuti, "əl-İtqan fi Ulum əl-Quran", 1/101-106; əz-Zurqani, "Mənəhilul-İrfan fi Ulum əl-Quran", 1/81-85;

gətirməsi mənasızdır. Əgər müəllifin qəsdini doğru anlamışıqsa o zaman deməliyik ki, Quran surələri haqqında belə bir təsəvvür xətalıdır. Məlumdur ki, bir surə uzun bir müddət ərzində fərqli vaxtlarda enir və Allahın elçisi enən ayələri hansı surədə, hansı ayədən sonra və ya əvvəl qoyulmasını katiblərinə əmr edirdi. Şübhəsiz ki, Maidə surəsi bir dəfəyə enməmişdi. Misal üçün Allah - "Ey iman gətirənlər! Həqiqətən, içki, qumar, bütlər və fal oxları şeytan əməli olan murdar şeylərdir. Bunlardan uzaq durun ki, bəlkə nicat tapasınız!" ayəti ilə içkini tamamilə haram etdi. Bu isə məşhur rəyə görə hicri üçüncü ildə Uhud döyüşündən sonra baş verdi.[93] Həmçinin bu surədə dəstəmaz ayəsi keçməkdədir və biz səhih hədisdən bilirik ki, bu ayə əl-Mureysi döyüşündə nazil olub[94] və bu döyüş hicri 4-cü il ilə 6-cı il arasında baş verib. Beləliklə də başa düşürük ki, Maidə surəsinin nazil olmuş ən sonuncu surələrdən biri olması heç də içindəki hər ayənin bu şəkildə gec nazil olmasını gərəkdirməz. Müəllifin bu sözlərinə yaxından diqqət edək: "**Tarixdən də aydın olduğu kimi, Peyğəmbər Mədinə şəhərində hökumət qurmuş və iqtidara çatmışdı. Kitab əhli orada müsəlmanlar üçün ciddi təhlükə mənbəyi hesab olunmurdular. Belə olan təqdirdə, görəsən, Allah niyə Peyğəmbərlə bu cür təhdid dili ilə danışır? Görəsən, Peyğəmbərin o günədək kitab əhlinə demədiyi nə qalmışdı ki, həmin vaxt onu deməsəydi, Allah yanında sanki islamın heç bir hökmünü təbliğ etməmiş hesab olunacaqdı? Bundan əlavə, Mədinə şəhərində kitab əhli hansı gücə sahib idi ki, Peyğəmbərin həyatı üçün təhlükə doğursun? Kitab əhli özləri Peyğəmbərə cizyə ödəməklə öz təhlükəsizliklərini təmin etməyə çalışırdılar. Onlar tərəfdən Peyğəmbərin təhlükəsizliyini təhdid edəcək ciddi heç bir təhlükə yox idi ki, Peyğəmbər buna görə narahatlıq keçirsin və Allah da ayə nazil edərək onu qoruyacağına zəmanət versin. Bütün bunlar ciddi suallardır və insanı dərindən düşünməyə vadar edir.**" Bu çox qəribə yanaşma tərzidir, sanki Peyğəmbərə qarşı təhlükə yalnız hərbi və siyasi gücdən gələ bilərdi, digər təhlükə üçün bir əsas yox idi. Məgər müəllifin unudubmu ki, Peyğəmbəri - salləllahu aleyhi va səlləm - yemək yedirərək zəhərləyən, onunla birlikdə yoldaşı Bişr bin əl-Bəra'nı öldürən bir yəhudi qadın deyildimi?! Hətta Allahın elçisinin o zəhərin verdiyi fəsadlar nəticəsində üç il sonra vəfat etməsini sünni və şiə qaynaqlar nəql edib

[93] bax: "Təfsir əl-Qurtubi", 6/285; İbn Teymiyyə, "Məcmu əl-Fətəva", 34/187; İbn Aşur, "ət-Təhrir vat-Tənvir", 7/22;
[94] "İbn Cuzey, "ət-Təshil li Ulum ət-Tənzil", 1/223; əl-Ayni, "Umdətul-Qari", 3/100; əş-Şənqiti, "Ədvaul-Bəyan", 2/20;

təsdiqləyirlər.[95] Allahın elçisinə - aleyhissalətu vassələm - sui-qəsd təşkil etmək yəhudilərin və onların şəhərdəki münafiq müttəfiqlərinin əlindən gələ biləcək bir iş idi. Ona görə də Təbriz müəllimin burada siyasi və hərbi gücləri müqayisə etməsi tamamilə yersizdir. Üstəlik dediyimiz kimi ayənin siyaqı da, məzmunu da bu fikri dəstəkləyir ki, ayədə sözü gedən "insanlar" kitab əhlindən olan kafirlər idi. Çünki ayənin axırında Allah buyurur: "Şübhəsiz ki, Allah kafir qövmü doğru yola yönəltməz." [5:67] Bunun həmən arxasında 68-ci ayədə yenə buyurur: "De: "Ey kitab əhli! Tövrata, İncilə və Rəbbinizdən sizə nazil edilənə (Qurana) əməl etməyincə bir şey (doğru yol) üzərində olmazsınız!" Rəbbindən sənə nazil edilən (Quran) onlardan bir çoxunun azğınlığını və küfrünü artıracaqdır. Ona görə də kafir qövm üçün kədərlənmə!" [5:68] Gördüyümüz kimi Quran özü-özünü açıqlayır, hər iki ayə müəyyən formada gəlmiş "kafir qövmdən" bəhs edir. İkinci ayə bunun kitab əhli olması baxımından şəkk qəbul etmir. Təbriz müəllim bu problemi də özünəxas bir şəkildə həll etməyə çalışır və yazır: "**Ayənin sonundakı "Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz" hissəsinə gəldikdə isə, yuxarıdakı hədisi əsas tutsaq, onda burada keçən "kafir camaat" sözündən məqsəd həqiqəti inkar edənlər, ona əməl etməyənlər olacaq. Yəni burada "kafir" sözünün terminoloji deyil, leksik mənasını əsas alacağıq.**" Bu, müəllifin kitab boyunca etdiyi ideoloji təhriflərindən biridir. Ayədəki "kafir qövm" sözü ilə həqiqi kafirlərin qəsd olunmadığını demək istəyir və ayəni bu şəkildə təvil etmək üçün əz-Zəhəbi'nin uydurma hökmü verdiyi hədisə əsaslanaraq edir. Lakin heç bir yerdə izah etmir ki, kafir olmayan, amma Allahın yenə də Kitabında "kafir qövm" olaraq vəsf etdiyi qövm kimdir?! Kitab əhli olmadığını, Məkkə müşrikləri olmadığını deyir, bəs görəsən kimdir?! Bu sualı kitabın müəllifi cavabsız buraxır. Peyğəmbərin ətrafındakılar ya onunla hicrət etmiş mühacirlər, ya da onu öz şəhərlərində ağırlamış və ona sahib çıxmış ənsarlar idilər. Yoxsa Allah bu ayədə "kafir qövm" ilə onları qəsd edir?! Əgər onları qəsd edirsə Quranın digər ayələrində Allahın bu mühacirləri və ənsarı tərifləməsini hansı uydurma hədislə təvil etməliyik?! Yox əgər onları qəsd etmirsə o zaman Allahın elçisi Mədinədəki bir qrup münafiqdənmi qorxaraq təbliğ etməyi gecikdirdi?!

Çox maraqlıdır ki, yəhudilərlə bağlı yuxarıdakıları yazdıqdan sonra müəllif bunu deyir: "**Həmin xəbər Əlinin rəhbərliyini elan etməkdir. Bunu insanlara çatdırmaq Peyğəmbər üçün olduqca çətin idi. Ona görə yox ki,**

---

[95] Bax: əs-Saduq, "əl-İtiqadət fi Din əl-İməmiyyə", səh: 97; əl-Amili, "Məsəlikul-Əfhəm", 11/459;

**insanlardan gələ biləcək fiziki şiddətə görə qorxurdu. Peyğəmbər hələ Məkkədə müşriklərin ən güclü vaxtlarında belə onların təhdidlərindən zərrə qədər çəkinməmiş, "bir əlimə Günəşi, bir əlimə də Ayı versəniz, yenə də öz yolumdan dönməyəcəyəm" demişdi, Taif şəhərində yerli sakinlər tərəfindən daşlandıqdan sonra da öz dəvətindən əl çəkməyib. Deməli, Peyğəmbərin belə bir narahatlığı yox idi. Onu narahat edən yeganə şey müsəlmanlara rəhbər olaraq təyin etdiyi şəxsin əmisi oğlu olması idi. Bu da anlaşılandır, belə ki, insanların "qohumunu özündən sonra rəhbər təyin edir" deyə onu qınayacaqlarından narahat idi.**" Etiraf etməliyəm ki, kitabın müəllifi oxucusunu çaşqınlığa salmağı gözəl bacarır. Bir qədər əvvəl yəhudilərdən qorxmaq üçün bir səbəbin olmadığını yazarkən onların hansısa siyasi və hərbi güclərinin olmadığını yazırdı. Bir neçə sətr sonra ümumiyyətlə ayədə belə bir qorxunun qəsd olunmadığını deyərək yəhudilərlə bağlı dediklərinin faydasız, mənasız bir söz yığınına çevirmiş oldu. Təbriz müəllimə görə ayədə qəsd olunan qorxu "qınayanların qınağından qorxmaqdır." Kitabının müqəddiməsində bu mənanın eynisini zikr edərək yazır: "**Həmin hədisdə qeyd olunduğuna görə, Peyğəmbər narahat idi ki, kimsə onu əmisi oğlunu xəlifə təyin etdiyinə görə qohumbazlıqda ittiham etsin və bu yolla həm onu, həm də həzrət Əlini hörmətdən salsın. Bu hədis ona dəlalət edir ki, Peyğəmbərin narahatlığı fiziki deyil, mənəvi müstəvidə idi. Allah da onu insanların qınağından, töhmətindən, ittihamlarından qoruyacağına və nüfuzunun aradan qalxmayacağına vəd verir.**" Gördüyümüz kimi hər iki yerdə müəllif buradakı qorxunun qınayanların qınağından qorxmaq olduğun deyir. Haşa! Peyğəmbərə yaraşmaz ki, qınayanların qınağından qorxduğu üçün Allahın ona əmr etdiyi hökmü təbliğ etməkdən çəkinsin və gecikdirsin! Allah elə Maidə surəsində bundan bir neçə ayə əvvəl Allahın razı qaldığı mömin tayfanı vəsf edərkən onların qınayanların qınağından qorxmadığını deyir: "Ey iman gətirənlər! Sizdən hər kim öz dinindən dönərsə, (bilsin ki,) Allah elə bir tayfa gətirər ki, Allah onları sevər, onlar da Allahı sevərlər. Onlar möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olar, Allah yolunda cihad edər və qınayanın qınağından qorx-mazlar." [5;54] Qınayanların qınağına qarşı Peyğəmbərin qəlbində bir qorxunun, bir narahatçılığın olduğunu demək və bunun onun təbliğatına mane olduğunu irəli sürmək ağır bir ittihamdır ki, yaradılmışların ən xeyirlisi üçün belə bir şey qəbul olunmaz.

Üstəlik biz deyirik ki, "Təbliğ" ayəsini doğru başa düşmək lazımdır. Ayəni oxuyub Allahın elçisinin - aleyhissalətu vassələm - kimlərinsə - istər fiziki, istərsə də mənəvi - zərərindən ehtiyat etdiyini demək doğru deyildir. Quranın üslubu ilə tanış olanlar nə dediyimizi anlayırlar. Bəqərə surəsində Allah - cəllə cələluhu - peyğəmbərinə deyir: "Əgər sənə gələn elmdən sonra onların istəklərinə uysan səni Allahdan qoruyan nə bir dost, nə də bir köməkçi tapılar."[2:120] Yenə eyni surədə buyurur: "Əgər sənə gələn elmdən sonra onların arzularına uysan, o zaman sən zalımlardan olarsan."[2:145] Allahın bu ayələrdə peyğəmbərinə - aleyhissalətu vassələm - bu şəkildə xitab etməsi onun batində yəhudilərə və ya nəsranilərə uymaq, onlara tabe olmaq istəyinin olduğuna dəlalət etməz. Əhzab surəsində Allah - azzə va cəllə - buyurur: "Ey Peyğəmbər! Allahdan qorx, kafirlərə və münafiqlərə itaət etmə! Həqiqətən, Allah hər şeyi biləndir, hikmət sahibidir."[33:1] Necə təsəvvür etmək olar ki, peyğəmbər kafirlərə və münafiqlərə itaət etmək istəmişdi və Allah buna görə onu təhdid edib?! Ona görə də əl-Bəqilləni təbliğ ayəsi barəsində yazır: "Bu, Allahın peyğəmbərinin - salləllahu aleyhi - halından onun təbliği və endirdiyini aşkardan elan etməyi tərk edəcəyini bildiyini gərəkdirməz..."[96] əz-Zərkəşi də qeyd edir ki, "peyğəmbər - salləllahu aleyhi va sələm - ona nazil olanı təbliğ etmişdir, beləliklə də burada təbliğə davam etməsi əmr olunur..."[97]

## Yerinə oturmamış arqumentlər

Müəllif kitabında bəzi yerlərdə həddindən artıq zəif və düşünülməmiş arqumentlər gətirir. Misal üçün 58-ci səhifədə yazır: "**Həzrət Əlinin məqsədi müsəlmanların dostu olduğunu ətrafındakılara çatdırmaq olsaydı, əmin olun ki, onlardan bu hədis barədə soruşardı. Bu iki hədisi müqayisə edin! Bir var, deyəsən ki, Peyğəmbər deyib ki, "Əli möminlərin dostudur." Bir də var, bunu "Əlini sevən mömin, sevməyən münafiqdir" şəklində daha konkret və sərt bir dillə deyəsən. Hansı daha təsirlidir? İnanın, müsəlmanların dostu olduğunu söyləmək istəyən biri heç vaxt bu**

96 əl-Bəqilləni, "əl-İntisar lil-Quran", 2/451;
97 əz-Zərkəşi, "əl-Bəhr əl-Muhit", 4/321;

**hədisi qoyub başqasından yapışmaz. Deməli, həm həzrət Əlinin özü, həm də bu hədisi Peyğəmbərdən eşitdiyinə şahidlik edən səhabələrin Qədirxum hədisində keçən "mövla" kəliməsindən başa düşdükləri məna rəhbərlik və idarəçilikdir.**" Sitatın sonu. Müəllifin burada etdiyi müqayisə tamamilə yanlışdır. Bunun iki səbəbi var. Birinci səbəb budur ki, Rəhbədə həzrət Əli səhabələrdən onların kollektiv olaraq eşitdikləri bir hədisə şahidlik etmələrini tələb edir, çünki Qədirxum hadisəsi minlərlə səhabənin hüzurunda baş vermişdi və Əli - kərraməllahu vachəhu - orda olan səhabələrdən kimin buna şahid olduğunu soruşarkən əmin idi ki, aralarında bunu Peyğəmbərdən eşidib xatırlayanlar olacaq. Digər hədisə gəldikdə isə onu tək bir yolla Əli bin Əbi Talib özü rəvayət edir, yəni Əli - radiyallahu anhu - özü tək rəvayət edir və deyir: "Toxumu yaran, canı yaradan və əzəmət libasını geyinən Allaha and olsun ki, bu ümmi Peyğəmbər mənə əhd etdi ki, "səni yalnız mömin sevər və yalnız münafiq sənə nifrət edər."[98] Əgər bu, Peyğəmbərin Əliyə xüsusilə əhd etdiyi bir söz idisə onunla bağlı qalxıb səhabələrdən şahidlik etməklərini tələb etməsi doğru olmazdı. İkincisi isə Əli haqqında gələn fəzilət sadəcə olaraq "Əli möminlərin dostudur" şəklində səslənmir. Xeyr! Bu fəzilət xüsusilə Əlinin sevgisini, Əlinin dostluğunu Peyğəmbərin sevgisi və dostluğu ilə əlaqələndirir. Yəni Allahın elçisini - salləllahu aleyhi va sələm - sevən kimsənin Əlini də sevməsi şərt olur.

Qədirxum hədisini izah edərkən müəllifdən birdən çox yerdə (misal üçün səh: 60) belə bir şərhə yer verir: "**Digər bir məsələ budur ki, Peyğəmbər onsuz da Yəməndən qayıdanda həzrət Əlidən şikayət edənləri tənbeh etmişdi ki, ondan heç bir şikayətiniz olmasın, çünki o heç bir səhv iş görməyib və götürdüyü qənimətlərə artıqlaması ilə layiqdir.**" Bu isə açıq-aşkar yalandır, çünki əlimizdə olan yeganə dəlil Peyğəmbərin - aleyhissalətu vassələm - Bureydə'nin şikayətinə verdiyi cavabdır, digər narazı möminlərə bu barədə tənbeh etməsi ilə bağlı rəvayətlərdə heç bir şey yoxdur.

[98] "Sahih Muslim", (131)

## İradı cavabsız qoymaq ustalığı

Burada çox önəmli bir yeri unutmayaq. Təbriz müəllim kitabında (səh: 61-63) xeyli əhəmiyyətli bir məsələyə toxunur və yazır: "**Şiələrin bu izahına edilən əsas irad budur ki, "Maidə" surəsinin 67-ci ayəsinə əsasən, əgər Peyğəmbər bu məsələni insanlara çatdırmasaydı, onda 23-ildə gördüyü bütün işlər puç olacaqdı. Halbuki şiə məzhəbinə görə, Peyğəmbər bu məsələni əvvəllər insanlara çatdırmışdı. Buna nümunə olaraq, "Maidə" surəsinin 55-ci ayəsini qeyd etmək olar. Ayə belə deyir: "Sizin vəliniz ancaq Allah, Onun Peyğəmbəri və namaz qılan, rüku halında zəkat verən möminlərdir." Şiə məzhəbinə görə, bu ayə həzrət Əli haqqında nazil olub və ayədə keçən "vəli" sözündən məqsəd rəhbərdir. Yəni sizin rəhbəriniz Allah, Onun rəsulu və Əlidir. Deməli, Peyğəmbər bu məsələni, yəni həzrət Əlinin vəli və rəhbər olduğunu insanlara çatdırıb. Bu mövzu ilə bağlı şiə hədis qaynaqlarında başqa hədislər də vardır ki, Peyğəmbər bir neçə dəfə həzrət Əlinin müsəlmanların vəlisi və xəlifəsi olduğunu qeyd edib. Belə olan təqdirdə, ayədə niyə deyilsin ki, sən bu məsələni çatdırmamısan, elə bil ki öz işini yarımçıq qoymusan və heç bir iş görməmisən?!**

**Bu irada cavabım belədir: "Peyğəmbərin bu məsələni bir neçə dəfə insanlara çatdırdığı doğrudur. Lakin görünən odur ki, bu barədə yenə nələrisə yenidən deməyə ehtiyac yaranmışdı. Qədirxum hadisəsinin "Təbliğ" ayəsi ilə əlaqəsinə ayrıca toxunacağam. Lap fərz edək ki, "Təbliğ" ayəsinin Qədirxum hadisəsi ilə heç bir əlaqəsi yoxdur. Nəticədə belə bir hadisənin baş verməsi faktdır, çünki bu barədə olan hədislər mütəvatirdir, deməli, onu inkar edə bilmərik. Yerdə qalır mətn ətrafında müzakirələr aparmaq. Şiə alimlərinin məsələyə yanaşması bu cürdür. Əhli-sünnə alimləri isə bu hadisəni tamam fərqli bir məsələ ilə əlaqələndirirlər. Onların qənaətincə, Peyğəmbərin Qədirxumda həzrət Əli haqqında dediyi həmin o məşhur kəlam qəlblərində ona qarşı kin və qəzəb olanlara yönəlmişdi. 78-ci hədisin şərhində də izah etdiyim kimi, Peyğəmbər həzrət Əlini xümsü bölməsi üçün Yəmənə göndərir. Həzrət Əlinin xümsdən özü üçün ayırdığı bəzilərinin narazılığına səbəb olur. Yəməndən qayıdan kimi Peyğəmbərə bu barədə şikayət edirlər. Peyğəmbər də həmin şəxslərin ürəklərində həzrət Əliyə qarşı heç bir kin və qəzəbin qalmaması üçün Qədirxumda onun bütün müsəlmanların mövlası, yəni dostu olduğunu deyir.**

**Fikrimcə, bu izah mübahisəlidir, çünki qarşı tərəfin gətirdiyi eyni irad bu izaha da şamil olur. Belə ki, Peyğəmbər əvvəllər də həzrət Əlinin möminlərin dostu, qardaşı olduğunu deyib. Hətta onu yalnız mömінin sevdiyini və ona yalnız münafiqin nifrət etdiyini xüsusi vurğulayıb. Bundan əlavə, Quran təkidlə möminlərin bir-biriləri ilə qardaş (Hücurat, 10) və dost (Tövbə, 71) olduqlarını söyləyir. İndi, həm Quranın ayələrində, həm də Peyğəmbərin kəlamlarında bu məsələ ümumi və xüsusi şəkildə dəfələrlə qeyd olunubsa, onda Qədirxumda, çölün ortasında insanlara nəsə önəmli bir mesajı çatdırırmış kimi onlara Əlinin onların dostu olduğunu deməyin nə kimi faydası var?! Əgər bir şeyi əvvəllər demək onu yenidən deməyin faydasız olduğuna dəlalət edirsə, deməli, qarşı tərəfin Qədirxum hadisəsinə verdikləri alternativ izah da heç bir məna kəsb etmir. Yox, əgər belə bir şey normaldırsa, onda bir şeyi bir neçə dəfə təkrar deməyin də heç bir problemi olmadığı aydın olur.**” Sitatın sonu. Biz burada kitabın müəllifinin sözlərini tam şəkildə verdik ki, müəllifin necə irada cavab verməkdən ustalıqla yayındığını göstərək. Əhlüs-sünnətin iradını zikr edir, lakin bu iradı cavabsız tərk edir, tamamilə başqa bir şey yazır. İradı bir az oxuculara açıqlaması lazım idi. Şiələr Maidə surəsindəki ayəni bu şəkildə anlayırlar: “Sizin vəliniz (rəhbəriniz, başçınız) ancaq Allah, Onun Peyğəmbəri və namaz qılan, rüku halında zəkat verən möminlərdir.” Əgər həqiqətən də bu ayədə “vəli” sözü ilə başçı qəsd olunursa, Peyğəmbərdən sonra möminlərin başçısının kim olduğu bəyan olunursa və ayə endikdə onu eşidənlər bu mənanı başa düşüblərsə o zaman onlara bu ayədə kimin qəsd olunduğunu ya Allahın elçisi bəyan edib, ya da bu barədə susub. Susması mümkün deyildir, çünki Peyğəmbərin vəzifəsi insanlara Allahın endirdiyini açıqlamaqdır. Həmçinin bəyanı ehtiyac anından sonraya təxirə salmaq Peyğəmbərlər üçün qüsurdur və yolverilməzdir. O zaman bu ayədə möminlərin vəlisinin Əli olduğunu Peyğəmbərin möminlərə bəyan etmiş olması lazımdır. Əgər belədirsə onda 67-cı ayədə Allah nə üçün Peyğəmbərini Əlinin vilayətini təbliğ etməyi əmr edir və təhdid edir? Allahın elçisi - aleyhissalətu vassələm - artıq insanlara Maidə surəsinin 55-ci ayəsini bəyan edib, onlara Allahın muradını açıqlayıb, insanlar da bunu Peyğəmbərdən eşidiblər, deməli bu hökm öz zamanında təbliğ edilib. Bəs nə üçün Allah deyir: “Rəbbindən sənə nazil edilən təbliğ et! Əgər bunu etməzsən, Onun risalətini təbliğ etməmiş olarsan.” Sanki evini təmizləyib qurtarmış birini evini təmizləməyi əmr edib təhdid etmiş kimi olursan!

Cinayətkarı edam etmiş cəllada cinayətkarı edam etməyi əmr edib təhdid etmiş olursan! Bütün bunlar Allahın hikmətindən mümkün olduğu qədər uzaqdır. Burada ya deyilməlidir ki, Maidə 55 Əlinin təyinatı ilə bağlı deyildir, ya da Maidə 67 Əlinin təyinatının təbliğini əmr etmir. Hər ikisini də eyni zamanda qəbul etmək mümkün deyildir. Təbriz müəllim özü də etiraf edir ki, "**Peyğəmbərin bu məsələni bir neçə dəfə insanlara çatdırdığı doğrudur.**" Biz bu etirafa görə ona təşəkkür edirik, lakin bu irada cavabı nədir? Təbriz bəy deyir ki, "**lakin görünən odur ki, bu barədə yenə nələrisə yenidən deməyə ehtiyac yaranmışdı.**" Bu isə əslində cavab deyildir, çünki bir şey insanlara təbliğ olunubsa deməli onların üzərindən üzr qaldırılıb, onlara daha əvvəl təbliğ olunmuş hansısa hökmü təkrar xatırlatmaq təbliğ sayılmır. Ayədə isə Allah Peyğəmbərinə təbliği əmr edir. Daha sonra buyurur: "**Lap fərz edək ki, "Təbliğ" ayəsinin Qədirxum hadisəsi ilə heç bir əlaqəsi yoxdur. Nəticədə belə bir hadisənin baş verməsi faktdır, çünki bu barədə olan hədislər mütəvatirdir, deməli, onu inkar edə bilmərik.**" Əgər "Təbliğ" ayəsinin Qədirxum hadisəsi ilə heç bir əlaqəsi olmadığını desək o zaman yuxarıdakı irada yer qalmır. Hadisənin baş verməsinə gəldikdə isə sünnət əhli də bu hadisənin baş verdiyini qəbul edir, Peyğəmbərin Əli haqqında o sözləri dediyini qəbul edir, ixtilaf isə o sözləri başa düşmək üzərindədir. Ona görə də Təbriz müəllim bunu fərz etdikdən sonra irada cavab vermək əvəzinə yenə Qədirxum hadisəsini necə doğru anlamağın lazım olduğunu müzakirə edir, halbuki hadisəni necə anlamaq yuxarıda verilən irada cavab deyildir. Təbriz bəy isə irada cavab verəcəyini söz vermişdi. "Təbliğ" ayəsinin Qədirxum hadisəsi ilə əlaqəli olmadığını fərz etmək irada cavab vermək deyil, iradla razılaşmaqdır. Onu da əlavə edək ki, Təbriz müəllim özü etiraf edir ki, Allahın elçisi - aleyhissələm - Qədirxumdan da əvvəl dəfələrlə insanlara Əlinin ondan sonra möminlərin əmiri olacağını bəyan etmişdi. O zaman bir şeyi anlaya bilmirəm; Təbriz bəy nə üçün kitabında uzun-uzadı Peyğəmbərin bunu bəyan və təbliğ etməkdən qorxub çəkindiyini, insanların qınağından ehtiyat etdiyini iddia edirdi? Əgər daha əvvəl bunu təbliğ edəndə insanların qınağından çəkinməmişdisə, "öz əmisi oğlunu təyin etdi" dedi-qodularından narahat olmamışdısa Vida həcci ərəfəsində niyə narahat olurdu ki? Bütün bunlar Təbriz müəllimin düşüncələrindəki ziddiyyətlərin danılmaz nümunələridir.

Gəlin irada verilən və ya verilməyən "cavaba" qayıdaq. Təbriz müəllim sözünün davamında deyir: "**Fikrimcə, bu izah**" - yəni sünnət əhlinin izahı -

**“mübahisəlidir, çünki qarşı tərəfin gətirdiyi eyni irad bu izaha da şamil olur.** ” Xeyr, şamil olmur. Çünki əhlüs-sünnət iddia etmir ki, Allah Quranda Peyğəmbərinə Əlinin möminlərin dostu olduğunu təbliğ etməyi əmr edir, belə bir iddia olmadığı üçün eyni iradı əhlüs-sünnətə şamil etmək alınmır. Axı sünnət əhli “Təbliğ” ayəsində sözü gedən təbliğ əmrinin hansısa müəyyən bir hökm ilə bağlı olduğunu demirlər. Ona görə də bir daha qayıdaraq - “**Əgər bir şeyi əvvəllər demək onu yenidən deməyin faydasız olduğuna dəlalət edirsə, deməli, qarşı tərəfin Qədirxum hadisəsinə verdikləri alternativ izah da heç bir məna kəsb etmir**” demək tamamilə mənasız qalır, çükni hansısa firqə deməyib ki, əvvəllər təbliğ olunmuş hökmü bir daha təbliğ etmək faydasızdır. Belə bir iddia əslən edilməyib. Burda irad bununla əlaqəli deyil. İrad deyir ki, Təbliğ ayəsindəki təbliğ əmri Əlinin vilayəti ilə bağlı ola bilməz, çünki artıq hasil olmuş bir şeyi təhsil etməyi əmr etmək və buna görə təhdid etmək ilahi hikmətdən deyildir, aşkar bir ziddiyyətdir.

Davamında yazır: “**Yuxarıdakı izahla bağlı nəzərə çarpan ən ciddi irad isə budur ki, həmin versiyaya əsasən, Peyğəmbər həzrət Əlidən şikayət edənlərin qəlblərində ona qarşı kin və qəzəbin qaldığını gördüyü üçün məcbur qalıb Qədirxumda həmin məşhur xütbəni söylədi. Halbuki bu izah tutarlı deyil, çünki əhli-sunnənin mötəbər hədis mənbələrinə nəzər saldıqda aydın olur ki, Peyğəmbər həmin şəxsləri həzrət Əlidən şikayət edən vaxt tənbeh etmiş, nəticədə onların həzrət Əliyə qarşı olan sui-zənləri aradan qalxmışdır**.” Daha sonra İmam Əhməddən Bureydə ilə Peyğəmbərin arasında keçən söhbətlə bağlı hədis nəql edir və deyir: “**Gördüyünüz kimi, Peyğəmbər həzrət Əlidən şikayət edənləri tənbeh etmiş, onlar da səhvlərini başa düşərək bu işdən əl çəkmişdilər. Hədislərdən belə aydın olur ki, həzrət Əlidən iki nəfər şikayət edib: Bureydə və Xalid ibn Vəlid. Peyğəmbər Bureydəni başa saldıqdan sonra o, səhvini başa düşərək Əliyə nifrət etməkdən əl çəkir…. Yerdə qalır Xalid. Ona da, yəqin ki, Bureydə Peyğəmbərlə görüşdükdən sonra məsələni izah edib və o da öz fikrindən əl çəkib… Belə olan təqdirdə, Peyğəmbər Qədirxumda həzrət Əlinin möminlərin dostu olduğunu kimlərə çatdırmaq istəyirdi?! Çünki artıq ona nifrət edəcək heç kim qalmamışdı. Gördüyünüz kimi, bu versiya olduqca tutarsızdır və tarixi faktlarla daban-dabana ziddiyyət təşkil edir.**” Burada bir neçə məsələ var. Həzrət Əli ilə aradakı narazılığın yalnız iki nəfərlə, yəni Bureydə və Xalid bin əl-Valid

ilə əlaqəli olduğunu demək doğru deyildir, çünki rəvayətlər buna dəlalət etmir; əksinə rəvayət onu göstərir ki, Vida həcci əsnasında xeyli sayda müsəlmanlar ilə Əli arasında ciddi bir narazılıq və xoşagəlməz bir qarşıdurma olub. Təbriz müəllim bu barədə varid olmuş rəvayətlərə baxsaydı bu cür bəsit xətalara yol verməzdi. İmam Əhmədin rəvayətində isə Əbu Said əl-Xudri deyir: "İnsanlar Əlini şikayət etdilər." Buna görə də Allahın elçisi - salləllahu aleyhi va səlləm - aramızda xütbə verdi və onu belə deyərkən eşitdim: "Ey insanlar, Əlidən şikayətlənməyin! Allaha and olsun ki, onun bir az sərt olması Allah üçündür."[99] Bir başqa rəvayətdə Yezid bin Rukənə deyir: "Əli bin Əbi Talib'in onunla birlikdə Yəməndə olmuş ordusu ona görə üzüldü ki, çünki onlara geri döndüklərində (Əli) onların üzərinə bir nəfəri təyin etdi və (özü) xəbərləri çatdırmaq üçün Allahın elçisinin - salləllahu aleyhi va səlləm - yanına getdi. Təyin etdiyi adam hər bir kəsə (yeni) bir paltar geyindirdi. Yaxınlaşdıqlarında Əli - radiyallahu anhu - çıxaraq onları qarşıladı və gördü ki, üzərilərinə paltarları geyiniblər. Əli dedi: "Bu nədir?" Dedilər: "Bizi fılankəs geyindirdi." Dedi: "Allahın elçisinin - salləllahu aleyhi va səlləm - istədiyi kimi etməyimiz varkən, onun yanına çatmadan əvvəl bunu etməyinə nə ehtiyac var idi?" Onların əynindən paltarları çıxardı. Onlar da Allahın elçisinin - salləllahu aleyhi va səlləm - yanına vardıqlarında ona bunu şikayət etdilər..."[100] Bu xəbərləri oxuduğumuzda peyğəmbərin - aleyhissalətu vassələm - səhabələrinə Əlinin fəzilətini xatırlatmağının səbəbini anlamış oluruq. Əhlüs-sünnət alimlərindən əl-Beyhəqi yazır ki, peyğəmbər - salləllahu aleyhi va səlləm - Əlini "Yəmənə göndərdikdə ondan şikayət edənlər çoxaldı, ona nifrətlərini izhar etdilər. Buna görə də peyğəmbər - salləllahu aleyhi va səlləm - onun özünə necə yaxın olduğunu, onu nə qədər sevdiyini zikr etməyi, bununla da onları onu sevməyə, onu dost edinməyə, ona ədavət göstərməməyə təşviq etmək istəmişdir. Beləliklə də "mən kimin vəlisiyəmsə Əli də onun vəlisidir" demişdir. Bəzi rəvayətlərdə "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır, Allahım, onu sevəni sev, ona düşmən olana düşmən ol!" deyir. Qəsd olunan isə İslam dostluğu və sevgisidir. Müsəlmanlara bir-birilərini sevməkləri, birbirilərinə düşmənlik etməməkləri vacibdir..."[101] Digər sünnət alimi İbn Kəsir yazır: "Hasil olan budur ki, Əli haqqında həmin orduda dedi-

---

[99] "Musnəd Əhməd", 18/337 (11817); Şeyx Şueyb ravilərinin siqa olduğunu təsdiqləyir.

[100] əl-Beyhəqi, "Dəlәil ən-Nubuvvə", 5/395;

[101] əl-Beyhəqi, "əl-İtiqad", səh: 354; Darul-Əfəq əl-Cədidə, Beyrut, 1401;

qodu çoxalmışdı; onlara zəkat dəvələrindən istifadə etməyi qadağan etməsi və naibinin onlara buraxdığı paltarları onlardan geri alması buna səbəb olmuşdu. Əli isə etdiklərində üzrlü idi. Lakin həcc edənlər arasında onun haqqında söz-söhbət məşhurlaşdı. Buna görə də - doğrusunu Allah bilir! - Allahın elçisi - salləllahu aleyhi va səlləm - həccindən qayıtdıqda, həcc ayinlərini edib qurtardıqda və Mədinəyə geri döndüyündə Ğadir Xum deyilən yerdən keçdi. İnsanların qarşısında xütbə verdi və Əlinin adını təmizə çıxardı, onun dəyərini qaldırdı və diqqətləri onun fəzilətinə yönəltdi ki, insanların bir çoxunun qəlbində ona qarşı yaranmış narazılıqları aradan qaldırsın."[102] Rəvayətlərdən anlaşılır ki, Əlidən narazılıq edənlər təkcə Bureydə və Xalid bin əl-Valid deyildi. Əksinə ordu sıralarında Əlinin əmirliyindən ciddi bir narazılıq var idi, əgər bu kiçik və əhəmiyyətsiz bir iş olsaydı bizə bu qədər fərqli yollarla xəbərləri gəlib çatmazdı. Xəbərlərdən həmçinin anlayırıq ki, həzrət Əli Peyğəmbərə onun həccində qoşulmaq üçün ordunu tərk edir və Məkkəyə gəlib çatır. Əbu Yalə əl-Məvsili'nin isnadı ilə İmam Cəfər əs-Sadiq'dən, onun da atası İmam əl-Baqir vasitəsi ilə Cabir'dən rəvayət etdiyi hədisdə Cabir, Peyğəmbərin Səfa və Mərva təpələri arasında səy etdiyini vəsf edir və deyir: "Yeddinci dəfə Mərva təpəsində olarkən buyurdu: "Ey insanlar! Əgər əmr etdiyim (bu işi) sonradan biləcəyim kimi əvvəlcədən bilsəydim, qurbanlığı gətirməzdim və (ehramımı) ümrə edərdim. Kimin ki, yanında qurbanlıq yoxdur, ehramdan çıxsın və (ehramını) ümrə etsin." Beləliklə, bütün insanlar ehramdan çıxdılar. Suraqa ibn Cu'şum dedi: "Ey Allahın Rəsulu, bu, təkcə bizim bu ilimiz üçündürmü, yoxsa əbədidir?" Peyğəmbər - salləllahu aleyhi va səlləm - barmaqlarını bir-birinə keçirib üç dəfə dedi: "Xeyr, əbədidir! Qiyamət gününə qədər ümrə həccin içinə daxil edilmişdir." Əli Yəməndən gəldi və özü ilə qurbanlıq gətirdi. Allah Rəsulu - aleyhissələm - isə Mədinədən özü ilə qurbanlıq gətirmişdi… Peyğəmbər Əlidən soruşdu: "Hansı niyyətlə ehrama girdin?" Əli cavab verdi: "Dedim: Allahım, sənin Rəsulunun ehrama girdiyi şeylə ehrama girirəm və yanımda qurbanlıq da var." Peyğəmbər buyurdu: "Elə isə ehramdan çıxma." Peyğəmbərin gətirdiyi və Əlinin gətirdiyi qurbanlıqların cəmi yüz idi. Allah Rəsulu - salləllahu aleyhi va əlihi va səlləm - öz əliylə altmış üçünü kəsdi, Əliyə də qalanını kəsməyi tapşırdı və onu öz qurbanlığında şərik etdi."[103] Buradan öyrənmiş oluruq ki, həzrət Əli - kərraməllahu vachəhu -

---

[102] İbn Kəsir, "əl-Bidəyə van-Nihəyə", 7/397; Dar Aləm əl-Kutub, Riyad, 1418;

[103] "Musnəd Əbi Yalə", 4/93 (2126); Kitabın mühəqqiqi Hüseyn Səlim Əsəd deyir ki, isnadı səhihdir.

Peyğəmbərə həccin əvvəlində yetişib, özü ilə birlikdə qurbanlıq heyvanlar gətirib və ehrama girib. Bunun zül-hiccə ayının beşi və ya altısı baş verdiyini deyə bilərik. Allahın elçisi həcc ilə ümrə niyyətini birlikdə edib, yəni qiran həcci edib. Qurbanlıq heyvanı olmayan digər kəslərin hamısına ehramdan çıxmağı əmr edib, Əliyə isə özü ilə birlikdə ehramda qalmağı buyurub. Daha sonra həzrət Əli həccin sonuna qədər Allahın elçisi ilə birlikdə olub. Əbu Said əl-Xudri deyir: "Özü tələsdi və həccə yetişdi. Həccini başa vurduqda peyğəmbər - salləllahu aleyhi va səlləm - ona dedi: "Öz yoldaşlarına geri dön ki, onlara çatasan."[104] Buna əsasən deyə bilərik ki, həccini başa vurduqda Allahın elçisi - aleyhissələm - həzrət Əliyə Yəməndən gələn ordunun yanına qayıtmasını əmr edib. Yezid bin Rukənə'nin rəvayət etdiyindən anlaşılır ki, Əli daha sonra ordudakıların yanına geri döndükdə onların qənimət mallarından istifadə etdiklərini görür və buna görə onları azarlayır və götürdüklərini əllərindən alır. Bir rəvayətdə deyilir ki, Əli onlara tapşırdı: "Allahın elçisinin - salləllahu aleyhi va səlləm - yanına varmadan əvvəl onları çıxarın!"[105] Əbu Said əl-Xudri'nin rəvayətində deyir: "Onlar da Allahın elçisinin - salləllahu aleyhi va səlləm - yanına vardıqlarında ona bunu şikayət etdilər…" Şübhəsiz ki, bu ordu Allahın elçisi ilə həcc bitdikdən sonra, lakin Qədir Xumdan əvvəl görüşüblər. Çünki həzrət Əli özü Qədir Xum hadisəsində orada iştirak edib və Allahın elçisinin yanında durub. Məlumdur ki, təşriq günlərini Allahın elçisi Minada keçirib və zül-hiccə ayının on üçü əl-Əbtəh deyilən yerdə dayanıb. Ayın on dördü vəda tavafını edib və ayın on beşi Məkkədən ayrılıb. Qədir Xum adlanan yerdə dayanmaq və orada xütbə vermək isə ayın on səkkizi baş verib. Belə görünür ki, bundan əvvəl Allahın elçisinə - aleyhissələm - şikayət edənlərin sayı çoxalmışdı.

Burada Təbriz müəllimin üzərində vurğu etdiyi çox maraqlı bir nöqtə var. O, qeyd edir ki, "**artıq ona nifrət edəcək heç kim qalmamışdı.**" Bu çox gözəl bir sözdür. Bunu deməyinə səbəb müəyyən məzmunda öz arqumentini gücləndirməkdir. Yəni artıq Əliyə nifrət edəcək heç kim qalmadığı üçün Allahın elçisinin - aleyhissələm - Qədirxumda o sözləri deməyinə ehtiyac qalmırdı. Maraqlı olan budur ki, sünnət əhli şiələrə etirazlarından biri də budur ki, ömürlərini və mal-dövlətlərini İslam peyğəmbərinin uğrunda fəda verən səhabələr nə üçün Allahın elçisinin - salləllahu aleyhi va səlləm -

---

[104] əl-Beyhəqi, "Dəlail ən-Nubuvvə", 5/398; İbn Kəsir "əl-Bidəyə van-Nihəyə" kitabında (7/396; ət-Turki) deyir: "Bu, ən-Nəsəinin şərtinə görə ceyyid bir isnaddır. "Kutub əs-Sittə" sahiblərindən heç biri bunu rəvayət etməyib."

[105] "Siratu İbn Hişəm", 2/603;

təyinatına xəyanət etsinlər ki?! Şiələr buna cavab olaraq deyirlər ki, çünki xəyanət edən səhabələr Əliyə nifrət edirdilər. Lakin burada Təbriz müəllim israrla deyir ki, Əliyə nifrət edəcək heç kim qalmamışdı və unutmayaq ki, bu hadisə Allahın elçisinin - salləllahu aleyhi va səlləm -vəfatından təxminən yetmiş gün əvvəl baş vermişdi. Əgər Əliyə nifrət edəcək heç kim qalmamışdısa o zaman xəyanət iddiası üçün göstərilən nifrət səbəbi də əsassız olur. Ona görə də qərar vermək lazımdır; səhabələr Əliyə nifrət edirdilər ya etmirdilər?!

Müəllif 66-cı səhifədə yazır: "**Aydındır ki, 2-3 nəfər arasında yaranan xırda bir narazılığa görə Peyğəmbərin insanları çöldə, qızmar istinin altında saxlayıb onlara guya nəsə çox önəmli bir xəbəri çatdıracaqmış kimi hazırlıq gördürməsi, sonra da kiçik bir xütbə söyləməsi, orada Allahın və özünün möminlər üzərindəki vilayətini təkidlə xatırlatması, bütün bunlardan sonra isə onlara "Əli sizin dostunuzdur" deməsi heç cür ağlabatan deyil. Amma əgər Peyğəmbərin məqsədi müsəlmanların gələcək xəlifəsini tanırdırmaq idisə, onda çölün ortasında baş verən bu hadisə, həzrət Əlinin ünvanına söylənən təbriklər xüsusi bir məna kəsb edir.**" 67-ci səhifədə isə yazır: "**Birincisi, Peyğəmbərin məqsədi xüms məsələsinə görə mədinəlilərlə həzrət Əli arasında yaranan narazılığı aradan qaldırmaq olsaydı, bunu elə Mədinəyə çatanda deyərdi. Belə bir məsələni çölün ortasında, özü də bu qədər təntənəli bir şəkildə izah etməyə ehtiyac yox idi.**" Burada Qədirxum haqqındakı təsəvvürdə ciddi bir xəta vardır. Allahın elçisinin - salləllahu aleyhi va səlləm - Qədirxumda Əliyə görə dayandığını əhlüs-sünnət demir, hədislərdə də belə bir məna yoxdur. Şiələr hadisənin əhəmiyyətini artıqmaq üçün mövcud rəvayətləri bacardıqları qədər dramatikləşdirməyə çalışırlar. Bütün bu drama və mənzərənin ağırlaşdırılması cəhdləri yalnız bir məqsədə xidmət edir. Peyğəmbər - aleyhissalətu vassələm - könüllü olaraq, öz istəyi ilə elə çətin və şəraitsiz bir yerdə dayanmadı, lakin həddindən artıq zəruri bir səbəb onu o yerdə dayanmağa məcbur etdi. Bu adi bir səbəb ola bilməzdi, mütləq dinin ən ağır fərzlərindən bir fərzin elan edilməsi ilə əlaqəli olmalı idi. Çünki sadəcə müstəhəb olan işlərdən ötrü minlərlə müsəlmana o istidə, o quraqlıqda əziyyət vermək halal olmazdı. Bütün bunları yalanlayan isə budur ki, "Ğadir Xum" suyun və ağacların olduğu bir yer idi və orada dayanmağın təbii səbəbləri var idi. Bunun ən başında onu qeyd edə bilərik ki, bəli, əl-Cuhfə tərəf çox isti və quraq bölgələrdir, lakin Cuhfənin bir hissəsi olan

Ğadir Xum dayanıb istirahət etmək üçün bölgədə ən əlverişli yerdir, çünki orada - şiə alimlərinin iddialarının əksinə - bol su və yaşıllıq var. əl-Qadi İyad (vəf. h. 544) deyir: "Ğadir Xum, bunu "xa" hərfində zikr etdik və bu, bir vadidir ki, orada bulaq axır və vadi ilə bulaq arasında peyğəmbərə aid bir məscid vardır."[106] Əbu Abdilləh Muhəmməd bin Abdilhəqq əl-Yəfurani ət-Tilmisəni (h. 536-625) yazır: "Ğadir Xum əl-Cuhfə'dən üç mil aralıdır, yolun solundadır. Bu ğadirdə/vadidə bir bulaq axır, ətrafında hər tərəfi saran çoxlu ağaclar var və bura "xum" adlanan kiçik meşəlikdir..."[107] İbnul-Cəvzi deyir: "əl-Cuhfə'dən bir mil əvvəl Ğadir Xum vadisi gəlir və bu vadi(nin suları) dənizə tökülür, orada mərx, darı və arak'dan başqa bir şey bitmir. Ğadir Xumu heç zaman su tərk etmir, yağış suları həmişə var. Orada Xuzəə və Kinənə qəbilələrindən insanlar var."[108] Bu deyilənlər öz təsdiqini hədislərdə tapır. Zeyd bin Ərqam deyir ki, "Allahın elçisi - salləllahu aleyhi va səlləm - vəfa həccindən qayıtdıqda Xum vadisində dayandı, kölgəliklərin təmizlənməsini əmr etdi..." Daha sonra peyğəmbərin - aleyhissələm - xütbəsini zikr edir və hədisi rəvayət edən Əbut-Tufeyl deyir: "Zeydə dedim: "Sən bunu özün Allahın elçisindən - salləllahu aleyhi va səlləm - eşitdin?" Dedi: "Kölgəliklərdə elə bir nəfər yox idi ki, onu öz gözü ilə görməsin və qulaqları ilə eşitməsin."[109] Bir başqa hədisdə Zeyd bin Ərqam deyir ki, "Allahın elçisini - salləllahu aleyhi va səlləm - günəşdən qorumaq üçün Səmura ağacına paltar qoyub kölgə düzəldildi..."[110] Zöhr namazını qılması üçün "Allahın elçisi - salləllahu aleyhi va səlləm - üçün iki ağacın altı təmizləndi..."[111] Bütün bunlardan belə bir nəticə çıxarmaq olar ki, şiələrin dedikləri kimi peyğəmbərin Ğadir Xumda dayanması, məcburiyyətdən doğmayıb, əksinə dayanmaq üçün uyğun bir yer olduğu üçün orada dayanıb. Allahın elçisi - aleyhissalətu vassələm - Məkkə və Mədinə arasında birdən çox yerdə dayanmalı olub, çünki hər şeydən əvvəl istirahət etməkləri və namazları qılmalı idilər. Qədir xum da belə yerlərdən biri olub, orada xütbə verərkən bir çox məsələni xatırladıb və Allahın elçisi - salləllahu aleyhi va

106 əl-Qadi İyad, "Məşəriqul-Ənvar alə Sihəh əl-Əsər", 2/143;
107 ət-Tilmisəni, "əl-İqtidab fi Ğarib əl-Muvatta va İrab aləl-Əbvab", 1/363; Məktəbətul-Ubeykən, 2001
108 İbnul-Cəvzi, "əl-Muntəzam fi Tarix əl-Muluk val-Uməm", 1/146;
109 ən-Nəsəi, "əs-Sunən əl-Kubra", 8092; Bu həmçinin onu göstərir ki, orada iştirak edənlərin sayı şiələrin iddia etdikləri qədər böyük ola bilməzdi, yoxsa o sayda qalabalığın peyğəmbərin - aleyhissalətu vassələm - xütbəsini eşitməsi mümkün olmazdı.
110 "Musnəd Əhməd", 32/73 (19325); Şeyx Şueyb hədisin səhih olduğunu, lakin məhz bu rəvayətdəki isnadın zəif olduğunu deyir.
111 "Musnəd Əhməd", 30/430 (18479); Şeyx Şueyb "sahih li ğayrihi" olduğunu yazır.

sələm - sadəcə olaraq fürsətdən istifadə edib və möminlərə Əlinin sevgisini xatırladıb.